QƏZET 01.02.1958-ci İLDƏN ÇIXIR

# GƏNC MÜƏLLİM

BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!
*Məhəmməd Peyğəmbər (S.)*

Oktyabr 2017
№ 6 (1085)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ



## Böyük Azərbaycan şairi və dramaturqu Hüseyn Cavidin 135 illik yubileyinin keçirilməsi haqqında
## *Azərbaycan Respublikası Prezidentinin Sərəncamı*

2017-ci ildə Azərbaycan ədəbiyyatının böyük nümayəndəsi, görkəmli şair və dramaturq Hüseyn Cavidin (Hüseyn Abdulla oğlu Rasizadənin) anadan olmasının 135 illiyi tamam olur.

Hüseyn Cavid son dərəcə dərin məzmunlu yaradıcılığı ilə çoxəsrlik Azərbaycan ədəbiyyatı xəzinəsinə tarixi-mədəni dəyərlər bəxş etmiş qüdrətli söz sənətkarıdır. O, Şərqin zəngin fəlsəfi-poetik irsi zəminində yüksələrək və dünya romantizm ənənələrindən uğurla bəhrələnərək Azərbaycan xalqının ədəbi-bədii fikir salnaməsinə parlaq səhifələr yazmışdır. Mütəfəkkir sənətkarın neçə-neçə oxucu və tamaşaçı nəslinin estetik zövqünü müəyyənləşdirən əsərləri bu gün də öz monumentallığını və yüksək təsir gücünü qorumaqdadır.

Totalitarizmin çoxsaylı qurbanlarından biri kimi Cavidin adı doğma xalqının təfəkküründə obrazlaşmışdır. Ağır repressiya illərində mənən sarsılmadan keçdiyi ibrətamiz həyat yolu onu yaddaşlarda sənətkar şəxsiyyətinin bütövlüyünün rəmzinə çevirmişdir.

Azərbaycan xalqının dahi oğlu Heydər Əliyevin şəxsi təşəbbüsü ilə Hüseyn Cavidin nəşinin hələ 1982-ci ildə uzaq Sibirdən vətəninə gətirilməsi və Naxçıvanda məzarı üzərində möhtəşəm məqbərənin ucaldılması milli ruhun dirçəlişi və azərbaycançılıq məfkurəsinin təntənəsi baxımından müstəsna əhəmiyyətə malik misilsiz bir hadisədir.

Azərbaycan ədəbiyyatının inkişafı naminə müstəsna xidmətlər göstərmiş böyük söz ustası Hüseyn Cavidin 135 illik yubileyinin layiqincə keçirilməsini təmin etmək məqsədi ilə, Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq **qərara alıram:**

1. Azərbaycan Respublikasının Mədəniyyət və Turizm Nazirliyi Azərbaycan Respublikasının Təhsil Nazirliyi, Azərbaycan Milli Elmlər Akademiyası və Naxçıvan Muxtar Respublikasının Ali Məclisi ilə birlikdə, Azərbaycan Yazıçılar Birliyinin təkliflərini nəzərə almaqla, Hüseyn Cavidin 135 illik yubileyinə həsr olunmuş tədbirlər planını hazırlayıb həyata keçirsin.

2. Azərbaycan Respublikasının Nazirlər Kabineti bu sərəncamdan irəli gələn məsələləri həll etsin.

**İlham ƏLİYEV**
**Azərbaycan Respublikasının Prezidenti**

*Bakı şəhəri, 24 oktyabr 2017-ci il*

## 5 Oktyabr-Beynəlxalq Müəllimlər Gününə həsr edilmiş tədbir

Oktyabrın 5-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rəhbərliyi, professor-müəllim heyəti və tələbə kollektivi Fəxri Xiyabanda xalqımızın ümummilli lideri Heydər Əliyevin məzarını ziyarət edib, məzarı önünə əklil qoyub, gül dəstələri düzüb. Görkəmli oftalmoloq alim, akademik Zərifə Əliyevanın da xatirəsi ehtiramla yad edilib, məzarı önünə gül dəstələri düzülüb. Sonra isə universitetin Böyük Akt zalında 5 Oktyabr-Beynəlxalq Müəllimlər Gününə həsr edilmiş tədbir keçirilib. Tədbirdə əvvəlcə Azərbaycanın Dövlət Himni səsləndirilib.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov tədbiri giriş sözü ilə açaraq universitetin kollektivini 5 Oktyabr-Beynəlxalq Müəllimlər Günü münasibətilə təbrik edib və uğurlar arzulayıb. Qeyd edib ki, bu gün universitetin kollektivinin həyatında çox xoş və əlamətdar bir gündür. Birləşmiş Millətlər Təşkilatının (BMT) ali mədəniyyət qurumu olan UNESKO tərəfindən 1966-cı il oktyabrın 5-də verilən qərar əsasında hər il oktyabrın 5-də dünyada Beynəlxalq Müəllimlər Günü keçirilir. Beynəlxalq Müəllimlər Günü dünyanın 100-dən çox ölkəsində, o cümlədən Azərbaycanda qeyd olunur.

Müəllim peşəsi cəmiyyətdə müqəddəs və şərəfli peşələrdən biri hesab edilir. Çünki məhz müəllim əməyinin nəticəsində cəmiyyət formalaşır, savadlı, bilikli, geniş dünyagörüşlü, nümunəvi əxlaqa malik insanlar yetişir. Belə insanlar cəmiyyəti inkişaf etdirir, ölkəni, dövləti gücləndirir. Bu gün müstəqil dövlətimizin daha da gücləndirilməsində fəal iştirak edən, cəmiyyətdə öz layiqli vətəndaş mövqeyi ilə seçilən insanlar məhz müəllim əməyinin yetirmələridir.



Yeni, müstəqil Azərbaycanın qurucusu, həmişə öz idarəçilik və dövlətçilik fəaliyyətində müəllim adına, müəllim əməyinə yüksək qiymət verən ümummilli liderimiz Heydər Əliyev demişdir: "Müəllim adı dünyada ən yüksək addır. Şəxsən mən Yer üzündə müəllimdən yüksək ad tanımıram".

Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyev müəllim peşəsinə yüksək qiymət verərək demişdir: "Müəllim Azərbaycanda ən hörmətli insandır. Müəllimlər hər bir cəmiyyətin elitasıdır".

Təhsil sahəsinin inkişafında Azərbaycan Respublikasının Birinci vitse-prezidenti Mehriban xanım Əliyeva böyük xidmətlər göstərir. Mehriban xanım Əliyevanın həyatımızın digər sahələri ilə yanaşı, təhsil sahəsində həyata keçirdiyi səmərəli əməli fəaliyyəti xalqımız tərəfindən yüksək qiymətləndirilir.

Son illər Azərbaycanda müəllim peşəsinin ictimai nüfuzunun artırılması üçün böyük işlər görülür. Ölkəmizdə 140 mindən çox orta məktəb müəlliminin bilik və bacarıqlarının diaqnostik qiymətləndirilməsi həyata keçirilib və onların əmək haqları artırılıb. Eyni zamanda təhsil sahəsinin inkişafında xüsusi xidmətləri ilə seçilən müəllimlərin əməyi rəğbətləndirilir, onlar dövlət tərəfindən təltif edilir, onlara fəxri adlar, mükafatlar verilir. Dövlət başçımızın oktyabrın 3-də Azərbaycan təhsilinin inkişafında xidmətlərinə görə 58 nəfərin "Tərəqqi" medalı ilə təltif edilməsi, 57 nəfərə "Əməkdar müəllim", 1 nəfərə "Əməkdar mədəniyyət işçisi", 1 nəfərə "Əməkdar bədən tərbiyəsi və idman xadimi" fəxri adlarının verilməsi, 1 nəfərin "Azərbaycan Respublikası Prezidentinin fəxri diplomu" ilə təltif edilməsi, 1 nəfərə isə Azərbaycan Respublikası Prezidentinin fərdi təqaüdünün verilməsi haqqında imzaladığı sərəncamlar təhsil sahəsinə göstərilən diqqət və qayğının növbəti təzahürüdür. Təhsil Nazirliyi tərəfindən "Gələcəyin müəllimi təqaüdü" təsis edilib. Bu təqaüd pedaqoji kadr hazırlığı aparılan ali təhsil müəssisələrinə qəbul imtahanlarında 500 və daha yüksək bal toplayan, ixtisas seçimində birinci və ya ikinci yerdə müəllimlik ixtisasını qeyd edən tələbələrə şamil olunur. Onlara əlavə 100 manat təqaüd verilir.

Tədbirdə ulu öndər Heydər Əliyevin və ölkə Prezidenti cənab İlham Əliyevin təhsilə və müəllimə münasibətini əks etdirən slayd nümayiş olunub, həmçinin yüksək balla universitetə qəbul olunan tələbələrə ADPU-nun və AQAC-ın ADPU Bölməsinin hədiyyələri təqdim edilib.

Tədbir Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədər hazırlıq fakültəsinin müəllim və tələbələrinin hazırladıqları maraqlı və rəngarəng konsert proqramı ilə başa çatıb.

Sonda rektor Cəfər Cəfərov tədbirin yüksək səviyyədə təşkilinə görə Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədər hazırlıq fakültəsinin müəllim və tələbələrinə təşəkkür edib.

**Mahirə Mustafayeva**






## Filologiya fakültəsinə 500-dən çox balla qəbul olunan tələbələrlə görüş

Oktyabrın 3-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rektoru, professor Cəfər Cəfərov 2017-2018-ci tədris ilində 500-dən çox bal toplayaraq Filologiya fakültəsinə qəbul olunan tələbələrlə görüş keçirib. Filologiya fakültəsinin və Kitabxana-İnformasiya Mərkəzinin birgə təşkilatçılığı ilə keçirilən görüşü giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov bildirib ki, ADPU öz fəaliyyətində keyfiyyətcə yeni bir mərhələyə daxil olub. ADPU həm struktur, həm də tələbə sayına görə ölkəmizin ən böyük ali təhsil müəssisələrindən birinə çevrilib. Hazırda ADPU-da 20 minə yaxın tələbə təhsil alır. Dövlət səviyyəsində həyata keçirilən tədbirlər nəticəsində Azərbaycan cəmiyyətində müəllim peşəsinin ictimai nüfuzu yüksəlib. Bu il 259 nəfər abituriyent 500-dən çox bal toplayaraq ADPU-ya qəbul olunub ki, bunun da 82 nəfəri Filologiya fakültəsinə qəbul olunub. Bu, çox sevindirici haldır. 2014-2015-ci tədris ilində cəmi 6 nəfər 500-dən çox bal toplayaraq ADPU-ya qəbul olunub. Ümummilli liderimiz Heydər Əliyev müəllim haqqında demişdir: "Mən Yer üzündə müəllimdən yüksək ad tanımıram". Xalqımızın, millətimizin taleyi, ölkəmizin gələcək inkişafı, dövlətimizin müdafiə qüdrəti məhz müəllimdən aslıdır.

**(Davamı 2-ci səhifədə)**

# Filologiya fakültəsinə 500-dən çox balla qəbul olunan tələbələrlə görüş

(Əvvəli 1-ci səhifədə)

Siz müasir dövrün tələblərinə cavab vermək üçün daim öz üzərinizdə çalışmalı, oxumalı, mütaliə etməli, xarici dilləri yaxşı öyrənməli, bilik və bacarıqlarınızı artırmalısınız. Siz ADPU-nun, eləcə də ölkəmizin gələcəyisiniz. Müəllimlik şərəfli, müqəddəs peşə olmaqla yanaşı, həm də məsuliyyətli peşədir. Bizim sizə yaxşı təhsil vermək üçün görüləcək işlərimiz, həyata keçirəcəyimiz tədbirlər çoxdur. Universitetdə təhsilin keyfiyyətinin yaxşılaşdırılması, hərtərəfli biliyə, geniş və müasir dünyagörüşünə, yüksək mənəvi-əxlaqi keyfiyyətlərə malik müəllimlərin işə cəlb edilməsi istiqamətində ciddi işlər görülür. Siz lazımi bilik və bacarıqları əldə etmək üçün bütün mövcud resurslardan düzgün və səmərəli istifadə etməlisiniz. Rektor çıxışının sonunda tələbə-gənclərə həyatda və təhsildə uğurlar arzulayıb.



Filologiya fakültəsinin dekanı, professor Buludxan Xəlilov çıxışında bildirib ki, tələbələr qazandıqları uğurla kifayətlənməməli, daha yüksək nəticələrə çatmaq üçün həmişə oxumalı, bilik və dünyagörüşlərini genişləndirməli, universitetin ictimai-mədəni həyatında fəal iştirak etməlidirlər. Kitab oxumaq, mütaliə etmək gənclər üçün çox vacibdir. Kitabları ürəklə, həvəslə oxumaq lazımdır. Yalnız bu halda gənclər yüksək səviyyəli mütəxəssis, əsl vətəndaş ola bilərlər.

Xalq şairi Qabilin oğlu, yazıçı, publisist, tərcüməçi Mahir Qabiloğlu çıxışında tələbələrə uğurlar arzulayıb, atasının 7 cildlik külliyatının 5 cildini ADPU-ya hədiyyə edib və qalan 2 cildi oktyabrın sonlarında universitetə təqdim edəcəyini vurğulayıb.

Kitabxana-İnformasiya Mərkəzinin direktoru Azər Hüseynov, Azərbaycan və dünya ədəbiyyatı kafedrasının müdiri, professor Himalay Qasımov, Ədəbiyyat və onun tədrisi metodikası kafedrasının müdiri, professor Zahid Xəlil çıxış edərək tələbələrə yaxşı oxumağı, ölkəmiz üçün peşəkar və müasir mütəxəssislər kimi yetişməyi tövsiyə ediblər.

Görüşdə tələbələrə kitablar hədiyyə edilib.

**Nigar Abbasova**

# ADPU XI Azərbaycan Beynəlxalq Təhsil Sərgisində iştirak edib



Oktyabrın 6-da Bakı Ekspo Mərkəzində Təhsil Nazirliyinin rəsmi dəstəyi ilə XI Azərbaycan Beynəlxalq Təhsil (“Education 2017”) Sərgisinin açılış mərasimi keçirilib. Qeyd edək ki, “İnsan kapitalı sərvətimizdir” devizi altında təşkil edilən sərgidə son illər Təhsil Nazirliyi tərəfindən həyata keçirilən yeni layihələr və mövcud təhsil imkanları təqdim olunub. Təhsil Nazirliyinin stendləri bu il daha geniş sahəni əhatə edib. Sərgi iştirakçılarına “SABAH qrupları”, “Azərbaycan üçün öyrət”, “Bir” Tələbə-Könüllü Proqramı”, “Maarifçi” Tələbə Kredit Fondu, “Sağlam təhsil-sağlam millət”, “Məktəblinin dostu”, “Modul tipli məktəblər”, “Olimpiadalara hazırlıq mərkəzi”, “Təhsildə informasiya və kommunikasiya texnologiyaları”, “Məktəbəhazırlıq”, “Kitabxana”, “Təhsil” Respublika İdman Mərkəzi, “İçərişəhər ənənəvi incəsənət mərkəzi”, “Peşə Təhsili üzrə Dövlət Agentliyi” və “Uşaq-Gənclər İnkişaf Mərkəzi” stendləri təqdim edilib.

Sərginin baş sponsoru Respublika fənn olimpiadalarının təşkilinə və “Azərbaycan üçün öyrət” proqramının həyata keçirilməsinə dəstək göstərən Kapital Bankdır. Sərgi həmçinin Azərbaycanda İxracın və İnvestisiyaların Təşviqi Fondu və Azərbaycan Respublikası Sahibkarlar (İşəgötürənlər) Təşkilatları Milli Konfederasiyası tərəfindən də dəstəklənib. Sərginin təşkilatçısı “Caspian Event Organisers” (“CEO”) şirkətidir.

Sərgidə ölkəmizin digər ali təhsil müəssisələri ilə yanaşı, Azərbaycan Dövlət Pedaqoji Universiteti (ADPU) də iştirak edib. ADPU-nun bu sərgidə iştirak etməsi üçün universitetin rektoru, professor Cəfər Cəfərov müvafiq əmr imzalayıb. Həmin əmrə əsasən yaradılan Təşkilat Komitəsi sərgiyə hazırlıqla bağlı bütün təşkilati-texniki və təchizati məsələləri həyata keçirib.

Təhsil naziri Mikayıl Cabbarov sərginin açılış mərasimində çıxış edərək bildirib ki, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 24 oktyabr 2013-cü il tarixli Sərəncamı ilə təsdiq edilmiş “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası” nazirliyin çoxşaxəli fəaliyyət istiqamətlərini müəyyən edən əsas sənəddir. Ölkə rəhbərliyi insan kapitalının inkişafına xüsusi diqqət yetirib. Son 13 ildə ölkəmizdə 3mindən çox orta məktəb inşa edilib. Müəllimlərin əmək haqlarının artırılması və bütövlükdə müəllim peşəsinin ictimai nüfuzunun yüksəldilməsi istiqamətində mühüm addımlar atılıb. Dünya İqtisadi Forumunun “2017-2018 Qlobal Rəqabətlilik Hesabatı”nda Azərbaycan reytinqdə daha iki pillə yüksələrək 35-ci yerdə qərarlaşıb. Bu, düşünülmüş və uğurla həyata keçirilən siyasətin nəticəsidir. Nazir çıxışının sonunda sərginin təşkilatçısı olan Caspian Event Organisers şirkətinin rəhbərliyinə təşəkkür edib.

Caspian Event Organisers şirkətinin Baş direktoru Edvarol Stroon çıxış edərək sərginin keçirilməsini ölkəmizin elmi-mədəni həyatında mühüm hadisə kimi qiymətləndirib və iştirakçılara uğurlar arzulayıb.

Məlumat üçün bildirək ki, bu il sərgi geniş işgüzar proqramı ilə fərqlənib, həmçinin sərgi çərçivəsində “Mənim gələcək peşəm və ona gedən yol” adlı seminar təşkil edilib. Sərgi çərçivəsində Almaniya, Avstriya, Belarus, İtaliya, Latviya, Litva, Macarıstan, Rusiya, Rumıniya, Sinqapur, Slovakiya və digər ölkələr universitet, kollec, ümumi təhsil müəssisələri və təhsil mərkəzlərini təqdim ediblər. Ümumilikdə sərgi çərçivəsində ziyarətçilərə bakalavriatura, magistratura, o cümlədən xarici dil kursları, təcrübə və treninqlər üzrə proqramlar təqdim edilib. Ziyarətçilər bilavasitə sərgidə aparıcı ali təhsil müəssisələrinin nümayəndələri ilə ünsiyyət quraraq qəbul prosesi, təhsil haqqı və digər məsələlərlə bağlı onları maraqlandıran suallara cavab almaq imkanı əldə ediblər. Həmçinin sərgidə fəaliyyət göstərmiş lektoriyada mühazirələr oxunub, startapçılar çıxış edib və təqdimatlar nümayiş olunub. Səhnədə isə respublika və beynəlxalq yarışların qalibləri, müsabiqə laureatları öz bacarıqlarını təqdim edib və milli rəqslər ifa olunub.

ADPU-nun sərgidə nümayiş etdirdiyi stenddə universitetin strukturu, tədris və elmi fəaliyyəti, professor-müəllim heyətinin çap edilən kitabları, bukletləri, müəllim və tələbələrin əl işləri yer alıb. ADPU-nun stendi ziyarətçilər tərəfindən maraqla qarşılanıb. Sərgi oktyabrın 8-də başa çatıb.

**Mənsur İbrahimli**

# Təkrar ali təhsilalanlarla görüş

Oktyabrın 4-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) 2017-2018-ci tədris ilində universitetə qəbul olunmuş təkrar ali təhsilalanlarla görüş keçirilib. Görüşdə ADPU-nun rektoru, professor Cəfər Cəfərov, Elmi işlər üzrə prorektor, professor Asəf Zamanov, Tədrisin İdarə Olunması və Tədris Texnologiyaları Mərkəzinin direktoru, dosent Sənan Əliyev iştirak ediblər.



Görüşü giriş sözü ilə açan rektor Cəfər Cəfərov təkrar ali təhsilalanları yeni tədris ilinin başlanması və 5 Oktyabr-Beynəlxalq Müəllimlər Günü münasibətilə təbrik edərək uğurlar arzulayıb. Bildirib ki, Təhsil Nazirliyinin təkrar ali təhsillə bağlı 2 avqust 2017-ci il tarixli məktubunun icrası ilə əlaqədar “Azərbaycan müəllimi” qəzetində müvafiq elan dərc edilib. Bu il ADPU-ya 15 ixtisas -“Azərbaycan dili və ədəbiyyatı müəllimliyi”, “Riyaziyyat müəllimliyi”, “İnformatika müəllimliyi”, “Riyaziyyat və informatika müəllimliyi”, “Tarix müəllimliyi”, “Coğrafiya müəllimliyi”, “Tarix və coğrafiya müəllimliyi”, “İbtidai sinif müəllimliyi”, “Məktəqədər təlim və tərbiyə”, “Korreksiyaedici təlim”, “Təhsildə sosial-psixoloji xidmət”, “Kimya müəllimliyi”, “Biologiya müəllimliyi”, “Kimya və biologiya müəllimliyi”, “Fizika müəllimliyi” ixtisasları üzrə ümumilikdə 130 nəfər təkrar ali təhsilə cəlb olunub.

ADPU ali pedaqoji təhsilin öncülü hesab edilir. Hazırda ölkəmizdə müəllim peşəsinin nüfuzunun yüksəldilməsinə xüsusi diqqət yetirilir. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 26 noyabr 2015-ci il tarixli Sərəncamı ilə Azərbaycan Müəllimlər İnstitutunun (AMİ) ADPU-ya qoşulması və onun filiallarının ADPU-nun strukturuna çevrilməsi nəticəsində ADPU pedaqoji kadr hazırlığı ilə məşğul olan unikal ixtisaslaşmış ali təhsil müəssisəsinə çevrilmişdir. Tədris 4 binada aparılır. ADPU-nun 5 filialı var. Azərbaycan Dövlət Pedaqoji Kolleci (ADPK) ADPU-nun nəzdində fəaliyyət göstərir. ADPU-da təxminən 20 minədək tələbə təhsil alır. Bu il 259 nəfər abituriyent 500-dən çox bal toplayaraq ADPU-ya qəbul olunub. Bu, ümumilikdə 12,6% -ni təşkil edir. 21 nəfər 500-dən çox bal toplayaraq ADPU-nun filiallarına qəbul olunub. Ümumilikdə ADPU-ya filiallarla birlikdə təxminən 300 nəfər 500-dən çox bal toplayaraq qəbul olunub. Universitetdə təhsilin keyfiyyətinin yüksəldilməsi, insan resurslarının təkmilləşdirilməsi, peşəkar kadr hazırlığının yüksək səviyyəyə qaldırılması, idarəetmənin optimallaşdırılması üçün ciddi islahatlar həyata keçirilir.



Rektor qeyd edib ki, siz müqəddəs, eyni zamanda məsuliyyətli müəllim peşəsini seçmisiniz. Malik olduğunuz bilik və bacarıqları ADPU-da daha da təkmilləşdirərək məktəblərdə gənc nəslin təlim-tərbiyəsi sahəsində çalışacaqsınız. Gənc nəslin yetişdirilməsi isə böyük və şərəfli vəzifədir. Biz sizə keyfiyyətli təhsil verməyi özümüzün başlıca vəzifəmiz hesab edirik. Siz ölkəmiz üçün yüksək səviyyəli pedaqoji kadrlar kimi yetişməlisiniz.

Elmi işlər üzrə prorektor, professor Asəf Zamanov çıxş edərək tədris prosesinin təşkili barədə məlumat verib, təhsilin keyfiyyətinin yüksəldilməsini və nizam-intizamın vacibliyini vurğulayaraq təkrar ali təhsilalanlara uğurlar arzulayıb.

Təkrar ali təhsilalanlar çıxış edərək qəbulun şəffaf və obyektiv keçirilməsinə görə ADPU-nun rəhbərliyinə təşəkkür ediblər. Sonda təkrar ali təhsilalanların müxtəlif sualları cavablandırılıb.

**Könül Nəzərova**

# ADPU-da "Azərbaycan-Türkiyə münasibətləri" II Beynəlxalq elmi konfransı keçirilib

Oktyabrın 12-14-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU), Azərbaycan Turizm və Menecment Universitetinin (ATMU) və Türkiyə Respublikasının Kastamonu Universitetinin birgə təşkilatçılığı ilə ADPU-da "Azərbaycan-Türkiyə münasibətləri" II Beynəlxalq elmi konfransı keçirilib. Konfrans iştirakçıları əvvəlcə Fəxri Xiyabanda Azərbaycan xalqının ümummilli lideri Heydər Əliyevin məzarını ziyarət edərək, abidəsi önünə əklil qoyublar. Görkəmli oftalmoloq alim, akademik Zərifə Əliyevanın da xatirəsi ehtiramla yad edilib, məzarı önünə gül dəstələri düzülüb. Sonra konfrans iştirakçıları Şəhidlər Xiyabanında Azərbaycanın ərazi bütövlüyü və dövlət müstəqilliyi uğrunda şəhid olmuş soydaşlarımızın məzarlarını və Türk Şəhidliyi Abidəsini ziyarət edərək "Əbədi məşəl" kompleksi, həmçinin Türk Şəhidliyi Abidəsinin önünə gül dəstələri düzüblər.

Beynəlxalq elmi konfransın plenar iclası ADPU-nun Böyük Akt zalında keçirilib. Öncə Türkiyənin və Azərbaycanın dövlət himnləri səsləndirilib. ADPU-nun rektoru, professor Cəfər Cəfərov plenar iclası giriş sözü ilə açaraq bildirib ki, Azərbaycan və Türkiyə ulu öndər Heydər Əliyevin müdrikliklə söylədiyi "Biz bir millət, iki dövlətik" fikrinə sadiq qalaraq müxtəlif sahələrdə, o cümlədən təhlükəsizlik, iqtisadiyyat, energetika, ticarət, hərbi-texniki və digər sahələrdə sıx əməkdaşlıq edirlər. Yüksək səviyyəli qarşılıqlı əlaqələr, ölkələrimizin həyata keçirdiyi çoxsaylı birgə layihələr ikitərəfli münasibətlərimizin möhkəmləndirilməsinə böyük töhfələr verir. Azərbaycan və Türkiyə beynəlxalq təşkilatlarda da bir-birinə dəstək verirlər. Hər iki ölkənin rəhbərlərinin siyasi sahədə uğurla həyata keçirdiyi əməkdaşlığı







universitetlər elm və təhsil sahəsində müvəffəqiyyətlə davam etdirirlər. Bizim bu gün keçirdiyimiz beynəlxalq elmi konfrans da bu əməkdaşlığın bariz nümunəsidir.

Rektor qeyd edib ki, beynəlxalq konfransın elmi istiqamətləri Azərbaycan Türkiyə tarixi əlaqələrini, siyasi və iqtisadi münasibətləri, sosial-mədəni və ədəbi əlaqələri, elm və təhsil, turizm və ekologiya sahələrini əhatə edir. Konfransın keçirilməsi üçün həmsədrlər müəyyən edilib, tərkibinə azərbaycanlı və türkiyəli alim-mütəxəssislər daxil edilən Təşkilat Komitəsi yaradılıb, konfransın koordinatorları, katibliyi və akademik heyəti müəyyənləşib. Konfransda Türkiyənin Azərbaycandakı fövqəladə və səlahiyyətli səfiri Erkan Özoral, Təhsil Nazirliyinin, Türkiyə Əməkdaşlıq və İnkişaf İdarəsinin (TİKA) məsul şəxsləri, AMEA-nın müvafiq elmi-tədqiqat institutlarının, Yunis Əmrə İnstitutunun nümayəndələri, ali təhsil müəssisələrinin tanınmış və nüfuzlu pedaqoq-alimləri iştirak edirlər. Konfrans Azərbaycan-Türkiyə münasibətləri ilə bağlı fikir mübadiləsi aparmaq, qarşılıqlı əlaqə və münasibətlərin genişləndirilməsi və bu sahədə yeni perspektivlərin müəyyənləşdirilməsi baxımından böyük əhəmiyyət kəsb edir. Konfransın keçirilməsi həm Azərbaycanın, həm də qardaş Türkiyənin ictimai-siyasi və elmi-mədəni həyatında əlamətdar bir hadisədir. Konfrans hər iki dövlətin elm və təhsil sahəsinin inteqrasiyasına səmərəli təsir edəcək. Rektor çıxışının sonunda konfransın işinə uğurlar arzulayıb.

Kastamonu Universitetinin rektoru, professor Seyit Aydın çıxış edərək konfransın keçirilməsinə görə ADPU-nun və ATMU-nun rəhbərliyinə təşəkkür edib. Bildirib ki, konfrans Türk və müsəlman dünyasının böyük mütəfəkkiri İsmayıl bəy Qaspıralının "Dildə,




işdə, fikirdə birlik" ideyasının əyani ifadəsidir. Konfrans iki qardaş ölkənin əlaqə və münasibətlərinin inkişafına müsbət təsir edəcək.

Azərbaycan Turizm və Menecment Universitetinin rektoru, dosent İlham Mədətov çıxışında qeyd edib ki, Azərbaycanla Türkiyə arasında münasibətlər həmişə yaxşı olub. Türkiyə 1918-ci ildə Azərbaycan Xalq Cümhuriyyətini tanıyan birinci ölkə olub. 1991-ci ildə də Azərbaycanın dövlət müstəqilliyini tanıyan ilk ölkə məhz Türkiyə olmuşdur. Bu gün Azərbaycan-Türkiyə




münasibətləri yüksələn xətlə inkişaf edir. Türkiyə Azərbaycanda keçirilən bütün beynəlxalq layihə və tədbirlərdə fəal iştirak edir. Azərbaycan-Türkiyə münasibətlərinin yüksək səviyyədə olması hər iki ölkənin güclənməsinə kömək edir.

Türkiyənin Azərbaycandakı fövqəladə və səlahiyyətli səfiri Erkan Özoral konfransın keçirilməsindən məmnunluq duyduğunu ifadə edib və konfransın təşkilatçılarına təşəkkür edib. Səfir vurğulayıb ki, dostluq və qardaşlıq Türkiyə-Azərbaycan münasibətlərinin təməl prinsiplərini təşkil edir. İki qardaş ölkə arasında münasibətlər bütün sahələrdə dinamik inkişaf edir. Bu münasibətlərin miqyası gələcəkdə daha da genişlənəcək.

Konfransda hədiyyələr təqdim edilib.

Plenar iclasdan sonra konfrans öz işini bölmə iclaslarında davam etdirib. Konfransın 6 bölmədə keçirilən iclaslarında ümumilikdə 83 elmi məruzə dinlənilib müzakirə olunub. Konfransda ADPU-nun və ATMU-nun magistrantları və doktorantları da iştirak ediblər. Konfransın bağlanış iclasında hər iki ölkənin təmsilçilərinin hesabatları dinlənilib.



**Mənsur Qüdrətoğlu**

# "Azərbaycan-Türkiyə münasibətləri" II Beynəlxalq elmi konfransının yekun iclası keçirilib

Oktyabrın 13-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU), Azərbaycan Turizm və Menecment Universitetinin (ATMU) və Türkiyə Respublikasının Kastamonu Universitetinin birgə təşkilatçılığı ilə ADPU-da keçirilən "Azərbaycan-Türkiyə



münasibətləri" II Beynəlxalq elmi konfransının yekun iclası keçirilib.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov yekun iclasda çıxış edərək bildirib ki, bu konfransın Azərbaycan-Türkiyə münasibətlərində xüsusi yeri var. Konfransın 6 bölmədə keçirilən iclaslarında ümumilikdə 83 elmi məruzə dinlənilərək müzakirə edilib. Konfrans Azərbaycan-Türkiyə münasibətləri ilə bağlı fikir mübadiləsi aparmaq, qarşılıqlı əlaqə və münasibətlərin genişləndirilməsi və bu sahədə yeni perspektivlərin müəyyənləşdirilməsi baxımından böyük əhəmiyyət kəsb edir. Konfransın keçirilməsi həm Azərbaycanın, həm də qardaş Türkiyənin ictimai-siyasi və elmi-mədəni həyatında əlamətdar bir hadisədir. Konfrans mediada geniş işıqlandırılıb, ictimai maraqa səbəb olub. Konfrans Azərbaycanla Türkiyə arasında əlaqə və münasibətlərin genişlənməsinə səmərəli təsir edəcək. Rektor beynəlxalq elmi konfransa ADPU-nun ev sahibliyi etməsindən qürur duyduğunu bildirib və bu işdə əməyi keçən hər kəsə təşəkkür edib.

Kastamonu Universitetinin rektoru, professor Seyit Aydın konfransın yüksək səviyyədə keçirilməsinə görə ADPU-nun və ATMU-nun rəhbərliyinə təşəkkür edib, iki qardaş ölkə arasında münasibətlərin yüksələn xətlə inkişaf etməsindən məmnunluq duyduğunu vurğulayıb.

İclasda konfrans iştirakçılarına sertfikatlar təqdim edilib. Sonda ADPU-nun Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədər hazırlıq fakültəsinin birləşmiş xoru, müəllim və tələbələri və eləcə də ATMU-nun tələbələri konsert proqramı ilə çıxış ediblər. İfa edilən xalq mahnıları, Azərbaycan və dünya bəstəkarlarının əsərləri hamıda xoş əhvali-ruhiyə yaradıb.



Qeyd edək ki, konfransdan sonra qonaqların Bakının görməli yerləri ilə tanışlığı da təşkil edilib. Konfransda edilən məruzələrin "Azərbaycan-Türkiyə münasibətləri II Beynəlxalq elmi konfransının materialları" adı ilə çap olunması nəzərdə tutulur.

**Nigar Zülfüqarqızı**

# Danimarkanın Kopenhagen Universitet Kolleci (UCC) ilə əməkdaşlıq əlaqələri genişlənir

Azərbaycan Dövlət Pedaqoji Universiteti (ADPU) ilə Danimarkanın Kopenhagen Universitet Kolleci (UCC) arasında 22 sentyabr 2016-cı il tarixdə Erasmus+ çərçivəsində "Fəaliyyət 1-Tələbə və heyət mobilliyi" müəssisələrarası müqavilə imzalanmışdır.

Müqavilə çərçivəsində ADPU-nun 3 heyət üzvü-Beynəlxalq əlaqələr şöbəsinin müdiri Gülnar Xəlilova, Xarici dillər və onların tədrisi metodikası kafedrasının müəllimi Aytən Cəfərova, Hesablama riyaziyyatı və informatika kafedrasının müəllimi Şəhla Rəsulova 26 fevral 2017-ci il tarixdən 5 mart 2017-ci il tarixinədək Danimarkanın Kopenhagen Universitet Kollecində keçirilən "Beynəlxalq həftə"də, 23-24 aprel 2017-ci il tarixdə isə ADPU-nun rektoru, professor Cəfər Cəfərov Danimarkanın Kopenhagen Universitet Kollecində (UCC) əməkdaşlıq görüşündə iştirak etmişlər.



Müəssisələrarası müqaviləyə əsasən ADPU-nun Filologiya fakültəsinin "Fransız dili" ixtisası üzrə təhsil alan IV tədris ili tələbəsi Lalə Satiyeva təhsilini 2017-2018-ci tədris ilinin payız semestrində Danimarkanın Kopenhagen Universitet Kollecində davam etdirir.

Müəssisələrarası həyata keçirilən tələbə heyəti mübadiləsinin davamı olaraq, ADPU-nun dəvəti ilə 9-13 oktyabr 2017-ci il tarixlərində Danimarkanın Kopenhagen Universitetinin Sosial elmlər fakültəsinin beynəlxalq əlaqələr üzrə qrup rəhbəri Annette Bruun, həmin fakültənin beynəlxalq əlaqələr üzrə koordinatoru Brigitte Damgaard və Müəllim hazırlığı fakültəsinin müəllimi Klaus Bruun Hansen Bakıya səfər etmişlər. Səfərin əsas məqsədi Azərbaycanın təhsil sistemi, o cümlədən məktəbəqədər təhsil müəssisələri ilə yaxından tanış olmaq, bilik və təcrübə mübadiləsi aparmaqdır.

Səfər çərçivəsində qonaqların 10 oktyabr 2017-ci ildə universitetin rektoru, professor Cəfər Cəfərovla görüşü keçirilmişdir. Görüş zamanı rektor qonaqlara ADPU-nun missiyası, Azərbaycanda abituriyentlərin ümumi imtahan prosesi, tələbələrin ixtisas seçimi və universitetin tələbə heyəti haqqında ətraflı məlumat verərək, müəllim hazırlığının ölkədə və tələbələr arasında artan nüfuzunu qeyd etdi. Minimal 500 bal toplayan tələbələrin bu ixtisasa yönəlməsi ölkədə pedaqoji təhsilə olan marağın hər il artdığının göstəricisi olduğunu bildirdi.

Rektor ADPU-nun Bakıda və regionlarda yerləşən filialları haqqında danışarkən hər il 3000 tələbənin qəbul olunduğunu və bir o qədər tələbənin məzun olduğunu vurğuladı. Eyni zamanda geniş inzibati heyətə malik olan universitetdə tədrisin və kadrların peşəkarlıq keyfiyyətinin inkişaf etdirilməsi istiqamətində köklü islahatların aparıldığını qeyd etdi. Bu baxımdan mübadilə proqramlarının, ikitərəfli əməkdaşlıqların universitetin inkişafında rolundan və faydalarından danışdı.

Görüşün sonunda qonaqlarla xatirə şəkli çəkildi.

Bundan başqa, qonaqlar universitetin Beynəlxalq əlaqələr üzrə prorektoru Nigar Abbaszadə ilə görüşərək Danimarkadan tələbələrin ADPU-da praktikaya göndərilməsi, İnklüziv təhsil və inklüziv təhsilə dair fəaliyyət planının təsdiqi, Erasmus+ çərçivəsində "Fəaliyyət 2 - İnnovasiyalar üçün əməkdaşlıq və ən yaxşı təcrübə mübadiləsi" haqqında müzakirələr apardılar.

Həmçinin qonaqların 11 oktyabr 2017-ci il tarixdə ADPU-nun Məktəbəqədər təhsil, Psixoloji xidmət və Korreksiyaedici təlim fakültəsində, 138 nömrəli tam orta məktəbdə, "Könül" körpələr evi-uşaq bağçasında və 183 nömrəli uşaq bağçasında kollektivlə görüşləri keçirildi. Görüş zamanı danimarkalı qonaqlar fakültə heyəti ilə tanış olaraq, mümkün əməkdaşlıq imkanları barədə müzakirələr aparıb fakültənin tələbələri ilə də görüşdülər.

Eyni zamanda xarici qonaqlar məktəb və bağçalardakı fəaliyyət planları ilə tanış olub onların fəaliyyətləri ilə bağlı söhbətlər apararaq sualları cavablandırdılar. Həmçinin nümayəndələr 12 oktyabr 2017-ci ildə ADPU-da keçirilən "Azərbaycan-Türkiyə münasibətləri" II beynəlxalq elmi konfransın açılış mərasimində iştirak etdilər. Azərbaycan tarixi və mədəniyyəti barədə təəssürat yaratmaq məqsədilə qonaqlar Bakının bir sıra tarixi-mədəni yerləri ilə tanış olaraq Azərbaycan haqqında xoş təəssüratlarını bölüşdülər.

# Azərbaycanın dövlət müstəqilliyinin bərpasının iyirmi altıncı ildönümünə həsr edilmiş tədbir

Oktyabrın 18-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Azərbaycanın dövlət müstəqilliyinin bərpasının iyirmi altıncı ildönümünə həsr edilmiş tədbir keçirilib. Tədbirdə ADPU-nun rəhbərliyi və professor-müəllim heyəti iştirak edib. Öncə tədbir iştirakçıları ulu öndər Heydər Əliyevin ADPU-dakı abidəsi önünə gül dəstələri qoyaraq xatirəsinə ehtiramlarını bildiriblər, sonra isə Heydər Əliyev muzeyini ziyarət ediblər. Tədbir Azərbaycan Respublikasının Dövlət Himninin səsləndirilməsi ilə başlayıb.




ADPU-nun rektoru, professor Cəfər Cəfərov tədbiri giriş sözü ilə açaraq universitetin kollektivini bu mühüm və əlamətdar tarixi gün münasibətlə təbrik edib, uğurlar arzulayıb. Qeyd edib ki, dünyada 5 minə yaxın xalq, 200-dən çox dövlət var. Müstəqillik xalqların həyatında böyük rol oynayan amildir. Azərbaycanın 3 minillik dövlətçilik tarixi var. 1991-ci il oktyabrın 18-də «Azərbaycan Respublikasının dövlət müstəqilliyi haqqında Konstitusiya Aktı» qəbul edildi. Bu Aktın qəbul edilməsi mühüm tarixi-siyasi hadisə idi və həmin gün tariximizə dövlət müstəqilliymizin bərpası günü kimi daxil oldu. Yeni yaranan müstəqil Azərbaycan dövləti özünün Azərbaycan Xalq Cümhuriyyətinin hüquqi varisi olduğunu bəyan edərək onun bayrağını, gerbini, himnini dövlət atributları kimi qəbul etdi.

Ulu öndərimiz Heydər Əliyev müstəqilliyin qorunmasının vacibliyini ön plana çəkərək demişdir: «Müstəqilliyin qorunması onun əldə edilməsindən qat-qat ağır və mürəkkəb vəzifədir». Azərbaycanın 1991-1993-cü illərdə yaşadığı ağır və üzücü ictimai-siyasi proseslər Ümummilli Liderimizin bu kəlamını bir daha təsdiqləyir. Məhz xalqımızın böyük oğlu, müdrik və mahir siyasətçi Heydər Əliyev öz zəngin təcrübəsi, yenilməz iradəsi hesabına Azərbaycanda möhkəm və dönməz daxili ictimai-siyasi sabitliyi təmin etdi. Dahi rəhbərimiz Azərbaycanın dövlət müstəqilliyini qoruyub saxladı, ölkəmizin beynəlxalq aləmə çıxışını təmin etdi, hüquqi, demokratik, dünyəvi dövlət quruculuğu və vətəndaş cəmiyyətinin yaradılması prosesi başlandı.

Qüdrətli siyasi xadim Heydər Əliyevin elmi əsaslara söykənən islahatlar strategiyasını uğurla davam etdirən Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev həyatımızın bütün sahələrinin dinamik inkişafını təmin etmişdir. Bayram həm də hesabat deməkdir. Ölkəmiz uğurla inkişaf edir. ADPU-nun bu inkişaf prosesində öz yeri və mövqeyi var. Universitetdə islahatlar aparılır, təmir-tikinti işləri həyata keçirilir. Bu günlərdə 4 fakültənin dekanı, 16 kafedranın müdiri seçilib. Hazırda universitetdə vakant tədris-yardımçı heyət üçün müsabiqə keçirilir. Müsabiqəyə 22 yer çıxarılıb, 35 nəfər sənəd verib. Məqsədimiz ADPU-ya yüksək bilik və bacarıqlara malik mütəxəssisləri cəlb etməkdir. Biz universitetdə təhsilin keyfiyyətini yüksəltməli, maddi-texniki bazanı gücləndirməli, elmi-pedaqoji kadr potensialını artırmalı, müstəqil dövlətimizin gücləndirilməsi və gələcəyinin təmin edilməsinə öz töhfələrimizi verməliyik.

Tədbirdə Türk və Şərqi Avropa xalqları tarixi və tarixin tədrisi metodikası kafedrasının müdiri, dosent Rəcəb Əliyev "Əbədi azadlığa gedən yolda" mövzusunda məruzə ilə, Azərbaycan tarixi kafedrasının professoru, tarix üzrə elmlər doktoru Xəqani Məmmədov isə "Heydər Əliyev müstəqil Azərbaycan dövlətinin banisidir" mövzusunda çıxış edib. Məruzə və çıxışda xalqımızın milli azadlıq uğrunda apardığı mübarizə, əldə etdiyi dövlət müstəqilliyi, ulu öndər Heydər Əliyevin yeni, müstəqil Azərbaycanın gücləndirilməsi naminə həyata keçirdiyi çoxşaxəli fəaliyyəti, milli hakimiyyət və dövlət quruculuğu, ölkəmizin bugünkü uğur və nailiyyətləri, dünya birliyinə inteqrasiyası və beynəlxalq siyasi nüfuzu öz dolğun əksini tapıb.

**Mahirə Mustafayeva**

# "İqtisadi islahatlar: nailiyyətlər və perspektivlər" mövzusunda ictimai mühazirə



Oktyabrın 20-də Azərbaycan Dövlət Pedaqoji Universiteti (ADPU) İqtisadi İslahatların Təhlili və Kommunikasiya Mərkəzi ilə birlikdə "İqtisadi islahatlar: nailiyyətlər və perspektivlər" mövzusunda ictimai mühazirə keçirib. Tədbirdə ADPU-nun rəhbərliyi, İqtisadi İslahatların Təhlili və Kommunikasiya Mərkəzinin icraçı direktoru, iqtisad elmləri doktoru Vüsal Qasımlı, professor-müəllim heyəti və tələbələr iştirak ediblər.

Tədbiri giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov bildirib ki, zaman-zaman universitetdə müxtəlif sahələrdə fəaliyyət göstərən tanınmış və nüfuzlu insanlarla görüşlər keçirilib. Bugünkü ictimai mühazirənin keçirilməsində məqsəd ADPU-nun müəllim və tələbələrinə ölkədə gedən iqtisadi proseslər, qazanılan uğurlar barədə məlumat verməkdir. Rektor müəllim və tələbələri ictimai mühazirədə fəal olmağa çağırıb.

İqtisadi İslahatların Təhlili və Kommunikasiya Mərkəzinin icraçı direktoru, iqtisad elmləri doktoru Vüsal Qasımlı ictimai mühazirənin təşkil edilməsinə verdiyi dəstəyə görə ADPU-nun rəhbərliyinə təşəkkür edib. Bildirib ki, Azərbaycan dövlət müstəqilliyi qazandıqdan sonra ölkəmizin ümumi inkişafının əsası ümummilli lider Heydər Əliyev tərəfindən qoyulub. Ölkəmizdəki ictimai-siyasi sabitlik iqtisadi inkişafa zəmin yaradıb. 1996-2016-cı illərdə Azərbaycanda ardıcıl surətdə iqtisadi artım olub. Bu iqtisadi artım neft amilinə əsaslanırdı. Lakin sonradan neftin qiymətinin düşməsi, neft hasilatının azalması və neftin maya dəyərinin yüksəlməsi yeni iqtisadi modelə keçidin zəruriliyini ortaya qoydu. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev bunu nəzərə alaraq strateji yol xəritələrini elan etdi. 12 strateji yol xəritəsi işlənib hazırlandı. Bu yol xəritələrinin icrası ilə bağlı geniş ictimaiyyətin iştirakı ilə müzakirələr aparılır. 2017-ci il tarixə iqtisadi islahatlar ili kimi düşdü. Bunun nəticəsində bu il iqtisadi artım baş verdi. 2018-ci ildə sürətli iqtisadi inkişafın olacağı proqnozlaşdırılır. Ölkə rəhbərliyinin həyata keçirdiyi uğurlu sosial-iqtisadi siyasət nəticəsində manatın sabitliyi saxlanıldı. Azərbaycan 7 neft-qaz kəmərinə malikdir. Ölkəmizdə əlverişli biznes mühiti mövcuddur, sahibkarlığa yüksək səviyyədə dəstək verilir. Azərbaycanda sənaye parkları, sənaye məhəllələri və texnoloji parklar fəaliyyət göstərir. Həmin sənaye parklarında, sənaye məhəllələrində və texnoloji parklarda bütün infrastruktur yaradılıb. Qeyri-neft sektorunun-kənd təsərrüfatının, turizmin, informasiya-kommunikasiya texnologiyalarının inkişafına xüsusi diqqət göstərilir. Aqrar sahədə böyük təsərrüfatlar yaradılır. Onlara güzəştli subsidiyalar ayrılır, texniki təchizatı təmin edilir. Azərbaycan məhsulları dünya bazarına çıxarılır. Bir müddət öncə Dünya İqtisadi Forumunun yaydığı "2017-2018 Qlobal Rəqabətlilik Hesabatı"nda Azərbaycan 2 pillə irəliləyərək 35-ci yerə yüksəlib. Bu, Azərbaycan Prezidenti İlham Əliyevin rəhbərliyi ilə ardıcıl şəkildə həyata keçirilən iqtisadi islahatların nəticəsidir. Vüsal Qasımlı tələbə-gənclərə yaxşı oxumağı, yüksək səviyyəli mütəxəssis kimi yetişməyi tövsiyə edib. Çünki yüksək bilik və bacarıqlar insan kapitalının formalaşmasında həlledici rol oynayır.





Maraqlı keçən görüşdə Azərbaycan təhsilinin dünya təhsil sisteminə inteqrasiyası, təhsil xidmətləri, təhsilin kommersiyalaşdırılması, əmək bazarının tələblərinə cavab verən müasir və rəqabətqabiliyyətli mütəxəssislərin hazırlanması və təhsil sahəsində yüksək inkişaf etmiş dövlətlərin təcrübəsinin öyrənilib tətbiq edilməsi ilə bağlı fikir mübadiləsi aparılıb, müxtəlif suallar cavablandırılıb.

Sonda rektor Cəfər Cəfərov ictimai mühazirənin keçirilməsinə görə iqtisadçı-alim Vüsal Qasımlıya təşəkkür edib və belə görüşlərin davamlı keçirilməsinin vacibliyini vurğulayıb.

**Mahirə Məhərrəmqızı**

# ADPU-nun Rektorluğu ilə Həmkarlar İttifaqı Komitəsi arasında Kollektiv Müqavilə imzalanıb

**Oktyabrın 20-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Rektorluğu ilə Həmkarlar İttifaqı Komitəsi arasında Kollektiv Müqavilə imzalanıb. Kollektiv Müqavilənin imzalanması ilə əlaqədar keçirilən tədbirdə ADPU-nun rəhbərliyi, Azərbaycan Təhsil İşçiləri Azad Həmkarlar İttifaqı (ATİAHİ) Respublika Komitəsi sədrinin müavini Mirzə Cəfərzadə iştirak ediblər.**



Həmkarlar İttifaqı Komitəsinin sədri, dosent Vaqif Əliyev çıxış edərək bildirib ki, bu gün ADPU-nun kollektivi üçün əlamətdar bir gündür. Qeyd edib ki, Kollektiv Müqavilə ADPU-da çalışan işçilərin sosial-əmək münasibətlərinin tənzimlənməsinin əsas prinsiplərini müəyyənləşdirmək, onların sosial müdafiəsi üçün zəruri olan şəraitin yaradılmasını və universitetin sabit, səmərəli fəaliyyətini təmin etmək məqsədilə Azərbaycan Respublikasının qanunvericiliyinə uyğun olaraq bağlanılır. Müqavilə ADPU-da çalışan professor-müəllim, tədris-yardımçı heyətə, təhsilalanlara, inzibati və digər işçilərə əmək, sosial-iqtisadi və hüquqi təlimatlar və imtiyazlar müəyyən edən hüquqi sənəddir. Müqavilədən işçilərlə fərdi əmək müqavilələri bağlanarkən, fərdi və ya kollektiv əmək mübahisələri yarandıqda istifadə oluna bilər. Müqavilənin tərəfləri ADPU-nun rəhbərliyi və Həmkarlar İttifaqı Komitəsidir (HİK). Müqavilədə ADPU-də yüksəkixtisaslı mütəxəssislərin hazırlanması, təhsilin keyfiyyətinin yüksəldilməsi, təhsilalanların hüquqlarının qorunması, təhsil sahəsinin inkişafı ilə bağlı dövlət proqramlarının və strategiyalarının yerinə yetirilməsi, yeni və mütərəqqi təhsil konsepsiyalarının tətbiq edilməsi, işçilərin və təhsilalanların əmək və sosial hüquqlarının qorunmasının təmin edilməsi, qarşılıqlı münasibətlərin qanunvericilik, sosial əməkdaşlıq və iştirakçılıq əsasında qurulması, ADPU-nun normativ hüquqi bazasının təkmilləşdirilməsi, işçilərin sosial-iqtisadi hüquqlarının müdafiəsi üzrə danışıqlar aparılmasında əməkdaşlıq edilməsi, işçilərin hüquqi biliklərinin artırılması üçün işəgötürənin nümayəndələrinin və işçilərin iştirakı ilə maarifləndirmə tədbirlərini həyata keçirilməsi, işçilərlə işəgötürən arasında əmək münasibətlərinin düzgün tənzimlənməsi məqsədilə ADPU-nun daxili intizam qaydalarını tərtib edilməsi, bu qaydalara əməl edilməsi üçün mükəmməl nəzarət mexanizminin hazırlanıb həyata keçirilməsi müəyyən edilib. Müqavilədə eyni zamanda işəgötürənlə HİK-in işçilərin əmək, sosial, iqtisadi hüquq və maraqlarının müdafiəsi sahəsində tərəflərin əməkdaşlığının və fəaliyyətinin əlaqələndirilməsi, əmək münasibətləri, əməkhaqqı və əmək normaları, iş və istirahət, əməyin mühafizəsi, mənzil-məişət, mədəni-kütləvi və idman tədbirləri və sosial müdafiə sahələrində öhdəlikləri öz əksini tapıb. Müqavilə iki il müddətinə bağlanılır. Müqavilədə göstərilən müddəalar ADPU-nun işçilərinə və onların ailə üzvlərinə verilmiş sosial təminatdır və əlavə maliyyə və digər imkanlar yaranarsa, bu təminatlar və imtiyazlar artırıla bilər. Əmək qanunvericiliyinə və bu Müqavilə ilə işçilərə verilmiş hüquq və imtiyazları məhdudlaşdıran hər hansı şərtlər yolverilməzdir. İşəgötürən HİK-ni kollektivin yeganə və səlahiyyətli nümayəndəsi kimi tanıyır. Müqavilə ADPU-da çalışan bütün işçilərə aiddir. Müqavilə qüvvədə olduğu müddətdə tərəflərdən hər hansı birinin öz üzərinə götürdüyü öhdəlikləri birtərəfli olaraq yerinə yetirməməsi yolverilməzdir. Müqaviləyə əlavə və dəyişikliklərin edilməsinə qarşılıqlı razılaşma əsasında yol verilir.



Sonra tərəflər Kollektiv Müqaviləni imzalayıblar.

ATİAHİ-nin Respublika Komitəsi sədrinin müavini Mirzə Cəfərzadə çıxış edərək Kollektiv Müqavilənin imzalanmasını əlamətdar bir hadisə kimi qiymətləndirib və tərəflərə uğurlar arzulayıb.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov çıxışında Kollektiv Müqavilənin mükəmməl hüquqi sənəd olduğunu bildirib, Həmkarlar İttifaqı Komitəsinin fəaliyyətini yüksək qiymətləndirib, komitənin universitetdə həyata keçirilən islahatlara, yeniliklərə hərtərəfli dəstək verdiyini vurğulayaraq təşəkkür edib və təşkilata uğurlar arzulayıb.

**Könül Nərimanqızı**

# Hüseyn Cavidin 135 illik yubileyinə həsr edilmiş tədbir

**Oktyabrın 26-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Filologiya fakültəsinin təşəbbüsü və təşkilatçılığı ilə universitetin Böyük Akt zalında böyük Azərbaycan şairi və dramaturqu Hüseyn Cavidin 135 illik yubileyinə həsr edilmiş tədbir keçirilib.**





Tədbiri giriş sözü ilə açan Filologiya fakültəsinin dekanı, professor Buludxan Xəlilov bildirib ki, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev oktyabrın 24-də böyük Azərbaycan şairi və dramaturqu Hüseyn Cavidin 135 illik yubileyinin keçirilməsi haqqında Sərəncam imzalayıb. Sərəncamda göstərilir ki, 2017-ci ildə Azərbaycan ədəbiyyatının böyük nümayəndəsi, görkəmli şair və dramaturq Hüseyn Cavidin (Hüseyn Abdulla oğlu Rasizadənin) anadan olmasının 135 illiyi tamam olur.

Hüseyn Cavid son dərəcə dərin məzmunlu yaradıcılığı ilə çoxəsrlik Azərbaycan ədəbiyyatı xəzinəsinə tarixi-mədəni dəyərlər bəxş etmiş qüdrətli söz sənətkarıdır. O, Şərqin zəngin fəlsəfi-poetik irsi zəminində yüksələrək və dünya romantizm ənənələrindən uğurla bəhrələnərək Azərbaycan xalqının ədəbi-bədii fikir salnaməsinə parlaq səhifələr yazmışdır. Mütəfəkkir sənətkarın neçə-neçə oxucu və tamaşaçı nəslinin estetik zövqünü müəyyənləşdirən əsərləri bu gün də öz monumentallığını və yüksək təsir gücünü qorumaqdadır.

Totalitarizmin çoxsaylı qurbanlarından biri kimi Cavidin adı doğma xalqının təfəkküründə obrazlaşmışdır. Ağır repressiya illərində mənən sarsılmadan keçdiyi ibrətamiz həyat yolu onu yaddaşlarda sənətkar şəxsiyyətinin bütövlüyünün rəmzinə çevirmişdir.

Azərbaycan xalqının dahi oğlu Heydər Əliyevin şəxsi təşəbbüsü ilə Hüseyn Cavidin nəşinin hələ 1982-ci ildə uzaq Sibirdən vətəninə gətirilməsi və Naxçıvanda məzarı üzərində möhtəşəm məqbərənin ucaldılması milli ruhun dirçəlişi və azərbaycançılıq məfkurəsinin təntənəsi baxımından müstəsna əhəmiyyətə malik misilsiz bir hadisədir.

Professor B.Xəlilov qeyd edib ki, Azərbaycan ədəbiyyatının inkişafı naminə müstəsna xidmətlər göstərmiş böyük söz ustası Hüseyn Cavidin 135 illik yubileyinin layiqincə keçirilməsini təmin etmək məqsədilə ölkəmizdə müxtəlif tədbirlər keçirilir. Bizim bu gün keçirdiyimiz tədbir də həmin tədbirlər silsiləsinə daxildir.

Azərbaycan və dünya ədəbiyyatı kafedrasının dosenti, filologiya üzrə fəlsəfə doktoru İsgəndər Orucəliyev çıxış edərək Hüseyn Cavidin həyat və fəaliyyəti haqqında ətraflı məlumat verib, onun həmişə düşüncələrimizə yenilik, mütərəqqi ideyalar gətirən dahi şair və dramaturq, görkəmli mütəfəkkir olduğunu vurğulayıb.

Tədbirdə Hüseyn Cavidin həyat və yaradıcılığına həsr olunmuş slayd göstərilib, musiqinin müşayiəti ilə tələbələrin ifasında şairin şeirləri səslənib, "Şeyx Sənan" əsərindən səhnə oylanılıb, şeirlərinə bəstələnmiş mahnılar dinlənilib. Tələbələrin çıxışları iştirakçılar tərəfindən maraqla qarşılanıb.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov çıxış edərək bildirib ki, belə tədbirlərin keçirilməsi bizi mənəvi cəhətdən zənginləşdirir. Xalqımızın böyük mənəvi xəzinəsi var. Bu mənəvi xəzinənin zənginləşməsində Hüseyn Cavid, eləcə də digər qüdrətli söz ustadlarımız misilsiz rol oynayıblar. Biz bu böyük mənəvi xəzinəyə sahib çıxmalı, onu qoruyub-saxlamalı, gələcək nəsillərə ötürməliyik. Siz gələcəkdə müəllim olacaq, Azərbaycan gəncliyini sağlam ruhda, milli-mənəvi dəyərlər əsasında tərbiyə edəcəksiniz. Müşahidə və düşüncələrim belə deməyə əsas verir ki, Azərbaycan gəncliyi, o cümlədən ADPU-nun tələbə-gəncləri düzgün yoldadır. Sevinir və qürur hissi duyuruq ki, bizim çox sağlam və bacarıqlı gənclərimiz var. Bizim əsas vəzifəmiz onları düzgün istiqamətləndirməkdir. Rektor çıxışının sonunda tədbirin ərsəyə gəlməsində zəhməti olan hər kəsə təşəkkür edib və uğurlar arzulayıb.

Sonda xatirə şəkli çəkdirilib.

**"Gənc müəllim"**

# Elm və innovasiyalar şöbəsi pilot layihə əsasında seminar-treninq keçirib

Oktyabrın 13-də Rusiya Təhsil Akademiyasının Təhsildə İnkişaf Strategiyası İnstitutunun UNİTVİN-UNESKO şəbəkə kafedrası ilə birgə "Regionlararası şəbəkə tərəfdaşlığı: Qlobal dünyada davamlı yaşamağı öyrənək!" pilot layihəsinin Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) reallaşdırılması məqsədilə Elm və innovasiyalar şöbəsi seminar-treninq keçirib. Rusiya Təhsil Akademiyasının Təhsildə İnkişaf Strategiyası İnstitutunun 20.04.2017-ci il tarixli 01-07/132 saylı məktubuna əsasən hazırlanmış tədbirlər planına müvafiq olaraq keçirilən seminar-treninqi Elm və innovasiyalar şöbəsinin baş mütəxəssisi Dilguşə Süleymanova aparıb.



Seminar-treninqdə ADPU-nun rektoru, professor Cəfər Cəfərov və Elmi işlər üzrə prorektor, professor Asəf Zamanov iştirak ediblər. Həmçinin ADPU-nun fakültələrindən, filiallarından və elmi-tədqiqat laboratoriyalarından 38 nəfər iştirak edib.

Öncə seminar-treninqin iştirakçılarını Elm və innovasiyalar şöbəsinin müdiri, dosent Yusif Aliyev salamlayaraq Minilliyin İnkişaf Məqsədlərini (MİM) əks etdirən qlobal problemlərdən danışıb və iştirakçılara uğurlar arzulayıb.

Seminar-treninqdə müxtəlif videoçarxlar, qlobal məqsədlərə həsr olunmuş animasiyalar, maraqlı təqdimatlar nümayiş etdirilib. İştirakçılar mövzuların təqdimatı ilə yanaşı, müxtəlif fərqli iş üsulları ilə tanış olublar, həmçinin onları maraqlandıran suallar təlimçi tərəfindən geniş izahlarla cavablandırılıb. İştirakçılara aktual məsələ ilə bağlı görüləcək işlərin mahiyyəti izah edilib. Seminar iştirakçıları tədbirin təşkilində xüsusi rolu olan Elm və innovasiyalar şöbəsinin əməkdaşlarına təşəkkür edərək belə tədbirlərin davamlı keçirilməsinin vacibliyini vurğulayıblar.

Qeyd edək ki, "Regionlararası şəbəkə tərəfdaşlığı: Qlobal dünyada davamlı yaşamağı öyrənək!" pilot layihəsi 23-24 noyabr 2017-ci ildə Rusiya Federasiyasının paytaxtı Moskva şəhərində forum-marafonla yekunlaşacaq. Həmin forum-marafonda ADPU nümayəndəsinin iştirakı nəzərdə tutulub.

# Türkiyə Respublikasının yaranmasının 94 illiyinə həsr edilmiş tədbir

Oktyabrın 27-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Türkiyə Respublikasının yaranmasının 94 illiyinə həsr edilmiş tədbir keçirilib. Tədbirdə Türkiyənin Azərbaycandakı Təhsil müşaviri Abdulqafar Böyükfırat, Dini xidmətlər müşaviri, professor Kamil Güneş, Türkiyə Əməkdaşlıq və İnkişaf İdarəsinin (TİKA) əməkdaşları iştirak ediblər. Qeyd edək ki, tədbir ADPU-da təhsil alan türkiyəli tələbələrin İdarə Heyətinin və azərbaycanlı tələbələrin təşəbbüsü və təşkilatçılığı ilə ərsəyə gəlib. Tədbirdə əvvəlcə Azərbaycanın və Türkiyənin dövlət himnləri səsləndirilib.






Elmi işlər üzrə prorektor, professor Asəf Zamanov çıxış edərək ADPU-nun rektoru, professor Cəfər Cəfərovun salamlarını tədbir iştirakçılarına çatdırıb. Professor Asəf Zamanov bildirib ki, bu tədbir tarixi bir günə həsr edilib. Türkiyə Respublikasının yaranmasının 94 illiyi bütün Türk dünyasında, o cümlədən Azərbaycanda müxtəlif tədbirlərlə qeyd olunur. Dünyada 5 mindən çox xalqın yalnız 200-ə qədərinin dövləti var ki, onlardan da ikisi Azərbaycan və Türkiyədir. Hər iki ölkənin tarixən bütün sahələrdə dostluq və qardaşlıq münasibətləri var. Ulu öndərimiz Heydər Əliyevin "Biz bir millət, iki dövlətik" ifadəsi iki qardaş xalq arasındakı mənəvi-siyasi birliyi özündə dolğun əks etdirir. Hər iki ölkənin rəhbərliyinin uzaqgörən və müdrik siyasəti nəticəsində hazırda Azərbaycanla Türkiyə arasında əlaqə və münasibətlər yüksək səviyyədə inkişaf edir. Bu əlaqə və münasibətlər strateji xarakter almışdır. Azərbaycanla Türkiyə həm regionda, həm də beynəlxalq təşkilatlarda yüksək səviyyədə əməkdaşlıq edir və bir-birinə hərtərəfli dəstək verir. Bu gün Türkiyə iqtisadi, siyasi və hərbi cəhətdən çox inkişaf etmiş bir ölkədir. Azərbaycan da hərtərfli tərəqqi, inkişaf yolundadır. Hər iki qardaş ölkənin belə inkişafı bizdə böyük sevinc və qürur hissi doğurur. Azərbaycanla Türkiyə arasında bir çox sahələrdə, o cümlədən təhsil sahəsində geniş əlaqələr qurulub. Azərbaycanlı tələbələr Türkiyədə, türkiyəli tələbələr isə Azərbaycanda təhsil alırlar. Azərbaycan universitetləri Türkiyə universitetləri ilə müəllim-tələbə mübadiləsi, birgə beynəlxalq elmi konfranslar, layihələr və digər tədbirlər həyata keçirir. Professor Asəf Zamanov çıxışının sonunda tədbirin keçirilməsinə görə türkiyəli tələbələrin İdarə Heyətinə və azərbaycanlı tələbə-gənclərə öz təşəkkürünü bildirib.



Türkiyənin Azərbaycandakı Təhsil müşaviri Abdulqafar Böyükfırat, Dini xidmətlər müşaviri, professor Kamil Güneş, "Vətənpərvərliyin Təbliğinə Dəstək" İctimai Birliyinin sədri Şəmistan Əlizamanlı və tələbələr çıxış edərək Cümhuriyyət bayramı ilə bağlı fikirlərini bölüşüblər. Çıxış edənlər hər iki ölkənin təhsil əlaqələrinin inkişafını, əldə olunan nailiyyətləri yüksək qiymətləndiriblər.

Tədbirdə türkiyəli və azərbaycanlı tələbələrin ifasında xalqa bağlılığı, milli ruhu, vətənpərvərliyi, millətsevərliyi, Türk dünyasının birliyini təbliğ və tərənnüm edən şeirlər, nəğmələr səsləndirilib. Bu şeir və nəğmələr iştirakçılarda yüksək əhvali-ruhiyyə yaradıb. Sonda xatirə şəkli çəkdirilib.

**Mahirə Mustafayeva**

# Tələbə Gənclər Təşkilatının təqdimatı

Oktyabrın 17-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Tələbə Gənclər Təşkilatının (TGT) I tədris ili tələbələri üçün təqdimatı keçirilib. Təqdimatda ADPU-nun rektoru, professor Cəfər Cəfərov, Tərbiyə işləri üzrə prorektoru, professor Fikrət Rzayev, İnzibati-təsərrüfat işləri üzrə prorektoru Ümid Mehdiyev,TGT-nin üzvləri və I tədris ili tələbələri iştirak ediblər. Tədbirdə əvvəlcə Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib.



Tərbiyə işləri üzrə prorektor, professor Fikrət Rzayev çıxışında TGT-nin fəaliyyətini yüksək qiymətləndirərək qeyd edib ki, TGT ADPU-nun çoxminli tələbə heyətinin fəal və öncül hissəsidir. Vurğulayıb ki, sizin həyatınızda yeni və məsuliyyətli mərhələ başlayıb. Tələbəlik illəri insan həyatının ən maraqlı, ən gözəl dövrüdür. Tələbəlik illərinin özünəməxsus xüsusiyyətləri var. Siz yaxşı oxumaqla bərabər, universitetin və ölkəmizin ictimai həyatında, mədəni-kütləvi tədbirlərdə fəal iştirak etməli, asudə vaxtınızı səmərəli keçirməlisiniz. Siz savadlı, bilikli mütəxəssis və əsl vətəndaş kimi yetişməlisiniz. Professor F.Rzayev çıxışının sonunda TGT-yə uğurlar arzulayıb.



TGT sədrinin birinci müavini Taleh Budaqov çıxış edərək bildirib ki, təşkilat 2005-ci ildən fəaliyyət göstərir. TGT-nin strukturu, fəaliyyət istiqamətləri barədə tələbə-gənclərə geniş məlumat verən T.Budaqov bildirib ki, TGT universitetin tələbələrinin ictimai-sosial həyatının zənginləşdirilməsi, onların savadlı mütəxəssis kimi yetişməsi, bilik və bacarıqlarının inkişafı üçün daim mühüm işlər həyata keçirir. TGT fəaliyyəti dövründə çoxsaylı layihələr, müxtəlif tədbirlər gerçəkləşdirib və bir çox uğurlara imza atıb. TGT ölkəmizdə keçirilən respublika və beynəlxalqmiqyaslı tədbirlərə dəstək verir. Ötən il TGT univeristetlər arasında "İlin ən yaxşı Tələbə Gənclər Təşkilatı" nominasiyasına layiq görülüb. T.Budaqov onlara göstərilən diqqət və qayğıya görə ADPU-nun rəhbərliyinə təşəkkür edib.



Tədbirdə TGT-nin tarixində öz fəallığı və uğurları ilə seçilmiş keçmiş sədri Sahil Qələndərov çıxış edərək təşkilatın fəaliyyətini müsbət səciyyələndirib və uğurlar arzulayıb. Tədbirdə təşkilatın fəaliyyətini əks etdirən videoçarx nümayiş etdirilib.

**Nurlan Səmədov**

# ADPU-nun tələbələri adlı təqaüdə layiq görülüblər

Oktyabrın 26-da Azərbaycan Həmkarlar İttifaqları Konfederasiyasında (AHİK) Azərbaycan Təhsil İşçiləri Azad Həmkarlar İttifaqı Respublika Komitəsinin (ATİAHİRK) adlı təqaüdlərinin və 2016-cı ildə beynəlxalq tədbirlərdə uğur qazanan bir tələbələrə verilir. Tədbirdə Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) "əla" qiymətlərlə oxuyan və Həmkarlar İttifaqının fəal üzvü olan 5 tələbəsinə - "Coğrafiya müəllimliyi" ixtisasının II tədris ilinin tələbəsi Səbinə Rəhimliyə,



qrup tələbəyə fəxri fərmanların və pul mükafatlarının təqdim edilməsi mərasimi keçirilib.

AHİK-in sədri, Milli Məclisin deputatı Səttar Mehbalıyev tələbələri adlı təqaüdlər və mükafatlar almaları münasibətilə təbrik edib və onlara təhsildə yeni uğurlar arzulayıb. Qeyd edək ki, ATİAHİRK-nin adlı təqaüdü 1995-ci ildə təsis edilib. Təqaüd payız və yaz imtahan sessiyalarının nəticələrinə görə "əla" və "yaxşı" qiymətlərlə oxuyan və Həmkarlar İttifaqının fəal üzvü olan "Riyaziyyat və informatika müəllimliyi" ixtisasının II tədris ili tələbəsi Səidə Abiyevaya (SABAH qrupları), "Sosial iş" ixtisasının III tədris ili tələbəsi Rəhilə Cəfərovaya, "İbtidai sinif müəllimliyi" ixtisasının III tədris ili tələbəsi Fidan Cəmilovaya və ADPU-nun Quba Fillialının "İbtidai sinif müəllimliyi" ixtisasının IV tədris ili tələbəsi Emin Tahayevə adlı təqaüd təqdim edilib.

Biz də bu münasibətlə tələbəgənclərimizi təbrik edir, onlara yeni-yeni uğurlar arzulayırıq.

# Kimya və biologiya fakültəsində akademik Əjdər Məcidovla görüş və "Stabil radikallı kompleks metallar (alınması, qurulması, xassələri və tətbiqi)" mövzusunda elmi seminar

Oktyabrın 25-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Kimya və biologiya fakültəsində Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) M.Nağıyev adına Qeyri-Üzvi Kimya və Kataliz İnstitutunun şöbə müdiri, AMEA-nın həqiqi üzvü, professor Əjdər Məcidovla görüş və "Stabil radikallı kompleks metallar (alınması, qurulması, xassələri və tətbiqi)" mövzusunda elmi seminar keçirilib.

Görüşü ADPU-nun Elmi işlər üzrə prorektoru, professor Asəf Zamanov açaraq akademik Ə.Məcidovun elmi fəaliyyəti haqqında geniş məlumat verib.



Professor-müəllim heyəti və tələbələrlə keçirilən belə görüşlərin əhəmiyyətini qeyd edərək sözü akademik Ə.Məcidova verib. Akademik Ə.Məcidov sərbəst radikalların metal kompleksləri haqqında məlumat verərək, onların alınmasında müxtəlif fiziki-tədqiqat metodlarının xüsusi rolunu ətraflı şərh edib. Müasir təlim texnologiyalarından istifadə etməklə görüş olduqca maraqlı keçib və akademik keçmiş Sovet İttifaqında olduqca səmərəli tədqiqatların aparıldığını və bu sahədə alimlərin xüsusi rolunu qeyd edib.



İclas fakültənin keçirdiyi elmi seminarla öz işini davam etdirib. Analitik və üzvi kimya kafedrasında elmi seminara rəhbərlik edən professor Telman Ağdamski akademiklə tələbə yoldaşı olduğunu və onun sonralar Yusif Məmmədəliyev tərəfindən Moskvaya aspiranturaya göndərildiyini diqqətə çatdırıb. Tələbəlik illərində birgə çəkdirdikləri şəkli və yeni çap etdirdiyi "Fiziki və kolloid kimya" dərsliyini hədiyyə olaraq akademikə təqdim edib.

Akademik Ə.Məcidovun haqqında kimya üzrə elmlər doktoru, dosent Əli Zalov və professor Nailə Verdizadə çıxış edərək onun xeyirxah bir vətəndaş olduğunu, şərəfli ömür yolu keçdiyini və mütəmadi olaraq akademiklə elmi əlaqələrinin olduğunu vurğulayıblar.

Sonda xatirə şəkli çəkdirilib.

# Elm və innovasiyalar şöbəsinin Tarix və coğrafiya fakültəsi ilə birgə iclası

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Elm və innovasiyalar şöbəsinin fəaliyyət planına uyğun olaraq oktyabrın 26-da şöbə Tarix və coğrafiya fakültəsi ilə birgə iclas keçirdi. İclası giriş sözü ilə şöbənin müdiri, dosent Yusif Alıyev açaraq universitetdə aparılan quruculuq işlərindən, təhsil və elmdəki islahatlardan danışdı. ADPU-nun rektoru, professor Cəfər Cəfərovun rəhbərliyi ilə universitetdə yaradılan şəffaflığın artıq bütün sahələrdə açıq-aydın göründüyünü qeyd etdi. Həmçinin bildirdi ki, universitetin bütün strukturları birgə fəaliyyət göstərəcəyi halda universitetimizin nüfuzu və reytinqi həm ölkə daxilində, həm də ölkə xaricində daha da artacaq. Əldə edilən elmi-innovativ yenilikləri təhsilin keyfiyyətinin artırılmasına yönəltsək, tədrisdə də böyük uğurlar qazanacağıq. Bunun üçün fakültələrdə tədrislə məşğul olan professor-müəllim heyəti mütləq tədrisdə mövcud olan problemlərlə bağlı elmi-tədqiqat işləri aparmalıdır ki, tədrisin keyfiyyəti yüksəlsin, - deyən dosent Y.Alıyev qeyd etdi ki, məqsədimiz birgə fəaliyyət nəticəsində yeni istiqamətlər üzrə işləməkdir.



Fakültənin dekanı, dosent Şahin Pənahov çıxış edərək fakültə haqqında ətraflı məlumat verdi. Dosent Ş.Pənahov Tarix və coğrafiya fakültəsinnin nəzdində "Tarix və etnoqrafiya" muzeyinin yaradılmasının vacibliyini qeyd etdi. Bildirdi ki, bu muzey tarixi yaddaşımızın bərpası baxımından olduqca vacibdir.

Sonra dosent Y.Alıyev ADPU-nun Tələbə Elmi Cəmiyyətinin (TEC) fəaliyyətindən danışaraq tələbələrin elmi-tədqiqat işlərinə cəlb olunmalarının və aktual mövzular üzərində işləmələrinin vacibliyini vurğuladı. ADPU-da fəaliyyət göstərəcək və tərkibinə gənc alimlərinin cəlb olunacağı Gənc Alimlər Şurasının yaradılmasının vacib olduğunu qeyd edərək artıq bu sahədə müəyyən işlərin görüldüyünü bildirdi. Universitetdə şahmat və dama turnirlərinin keçirilməsi və fənn Olimpiadasının təşkili məsələləri ilə bağlı problemlərə toxundu.

Tədbirdə kafedra müdirləri, fakültənin əməkdaşları çıxış edərək görülən işlərdən, fakültənin nailiyyətlərindən danışdılar.

Görüşdə Elm və innovasiyalar şöbəsinin mütəxəssisləri Almarə Abbasova, Arzu Kərimova, Zenfira Seyidova iştirak edirdilər. Şöbənin əməkdaşları fakültə ilə daha sıx işləməyin yolları ilə bağlı fikir və təkliflər irəli sürdülər.

# Riyaziyyat və informatika fakültəsində 500-dən çox bal toplayan tələbələrlə görüş



Oktyabrın 12-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Riyaziyyat və informatika fakültəsində 500-dən çox bal toplayan tələbələrlə görüş keçirilib. Görüşü giriş sözü ilə açan Riyaziyyat və informatika fakültəsinin dekanı, dosent Maqsud Nəcəfov tələbələri təbrik edib, onlara uğurlar arzulayıb. Dosent M.Nəcəfov qeyd edib ki, bu il 500-dən çox bal toplayaraq ADPU-ya qəbul olunmuş 259 nəfər tələbənin 55 nəfəri Riyaziyyat və informatika fakültəsinə qəbul olunub. Bu, uğurlu göstəricidir. Müqayisə üçün qeyd edək ki, ötən tədris ilində 16 nəfər 500-dən çox bal toplayaraq Riyaziyyat və informatika fakültəsinə qəbul olunub. Siz yaxşı oxumalı, nizam-intizamlı olmalı, universitein ictimai həyatında fəal iştirak etməli, ölkəmiz üçün yüksək səviyyəli mütəxəssis və əsl vətəndaş kimi yetişməlisiniz.

Sonra Riyaziyyatın tədrisi metodikası kafedrasının müdiri, professor Azadxan Adıgözəlov, Riyazi analiz kafedrasının müdiri, dosent Bəhram Əliyev, Cəbr və həndəsə kafedrasının müdiri, dosent Zahirəli Sadıxov, Hesablama riyaziyyatı və informatika kafedrasının dosenti Zenfira Tağıyeva çıxış edərək, tələbələrə bilik və bacarıqlarını artırmağı, respublikamız üçün layiqli mütəxəssizlər olmağı arzulayıblar.

# Fizika və texnologiya fakültəsinin Elmi Şurasının iclası

Oktyabrın 30-da Fizika və texnologiya fakültəsinin Elmi Şurasının iclası keçirilib. İclası giriş sözü ilə açan fakültənin dekanı, fizika üzrə fəlsəfə doktoru Arzu Daşdəmirov yeni seçilmiş kafedra müdirlərini təbrik edərək onlara uğurlar arzulayıb. Sonra A.Daşdəmirov Elmi Şura üzvlərini iclasın gündəliyi ilə tanış edib və səsvermə nəticəsində iclasın gündəliyi aşağıdakı kimi təsdiq edilib:

1. Fakültə dekanının hesabatı
2. Kafedraların perspektiv iş planlarının müzakirəsi və təsdiqi
3. Tədris-Metodiki Şuranın hesabatı
4. Fənn komissiyalarının yaradılması
5. Magistr mövzularının və rəhbərlərin təsdiqi
6. Cari məsələlər



Birinci məsələ ilə bağlı fakültənin dekanı A.Daşdəmirov çıxış edərək fakültədə hesabat dövründə görülən işlər haqqında məlumat verib. A. Daşdəmirov qeyd edib ki, fakültənin inkişaf strategiyası və fakültənin missiyası-müasir keyfiyyət standartları əsasında, "Fizika müəllimliyi" və "Texnologiya müəllimliyi" ixtisasları üzrə, pedaqoji təhsil sahəsində respublikada liderliyin ələ alıınması; fakültənin intellektual mühitinin yaxşılaşdırılması; müasir tələb və texnologiyalar əsasında fakültənin müsbət ənənələrini qoruyaraq tədris sisteminin kompleks modernləşdirilməsi; kadr potensialının inkişafı və keyfiyyət xarakteristikalarının yaxşılaşdırılması; fakültənin elmi-tədqiqat potensialının sistemli şəkildə inkişafı; beynəlxalq əlaqələrin qurulması, xarici universitetlərlə tələbə mübadiləsi; tədris və elmi laboratoriyaların təhcizatının, multimedia, kompüter proqram təminatının qrant və layihələr hesabına yaxşılaşdırılması və s. kimi məsələlərdən ibarətdir.

Çıxış edən Elmi Şura üzvləri-professor Edil Eyvazov, professor Şükür Əlizadə və dosent Akif İsmayılov hesabat dövründə dekan A.Daşdəmirovun fəaliyyətini yüksək qiymətləndiriblər.

İkinci məsələ ilə əlaqədar Ümumi fizika kafedrasının müdiri, dosent Cahangir Hüseynov, Fizika və onun tədrisi metodikası kafedrasının müdiri, dosent Sevinc Cəlilova, Texnologiya və onun tədrisi metodikası kafedrasının müdiri, dosent Səadət Musayeva çıxış edərək kafedraların perspektiv planları barədə məlumat veriblər. Müzakirələrdə professor İsa İsmayılov, dosent Aydın Ələkbərov çıxış edibər.

Üçüncü məsələ ilə əlaqədar Tədris-Metodiki Şuranın sədri, professor Həmzə Seyidli çıxış edərək Şuranın hesabat dövründə gördüyü işlər barədə məlumat verib.

Daha sonra Elmi Şura fənn komissiyalarının yaradılması, magistr dissertasiyalarının mövzularının və elmi rəhbərlərinin təsdiqi ilə bağlı məsələləri müzakirə edərək müvafiq qərarlar qəbul edib. Sonda Elmi Şura cari məsələləri müzakirə edərək işini yekunlaşdırıb.

## İbtidai təhsil fakültəsində “Azərbaycan Respublikasının milli iqtisadiyyat perspektivi üzrə Strateji Yol Xəritəsi” ilə bağlı tədbir

Oktyabrın 16-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) İbtidai təhsil fakültəsində “Azərbaycan Respublikasının milli iqtisadiyyat perspektivi üzrə



Strateji Yol Xəritəsi” ilə bağlı tədbir keçirilib. Tədbiri fakültənin dekanı, pedaqogika üzrə elmlər doktoru, professor, Əməkdar elm xadimi Fərrux Rüstəmov açaraq 2016-cı il dekabrın 6-da Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev tərəfindən təsdiq edilmiş “Azərbaycan Respublikasının milli iqtisadiyyat perspektivi üzrə Strateji Yol Xəritəsi” haqqında nəlumat verib. Qeyd edib ki, milli iqtisadiyyat və iqtisadiyyatın əsas sektorları üzrə strateji yol xəritələri Azərbaycanda davamlı iqtisadi inkişaf əsasında iqtisadiyyatın rəqabətqabiliyyətliliyini, inklüzivliyini və sosial rifahın daha da artırılmasını təmin edəcək. Qlobal çağırışlara cavab verərək investisiyaların cəlbi, azad rəqabət mühiti, bazarlara çıxış və insan kapitalının inkişafı nəticəsində Azərbaycan dünya iqtisadiyyatında mövqeyini gücləndirəcək və yüksək gəlirli ölkələr qrupuna daxil olacaq. Milli iqtisadiyyat və iqtisadiyyatın 11 sektoru üzrə ümumilikdə 12 strateji yol xəritəsi hazırlanıb. Milli iqtisadiyyat perspektivi üzrə Strateji Yol Xəritəsi qısa, orta və uzunmüddətli dövrləri əhatə etməklə, 2020-ci ilədək iqtisadi inkişaf strategiyası və tədbirlər planı, 2025-ci ilədək olan dövr üçün uzunmüddətli baxış və 2025-ci ildən sonrakı dövr üçün hədəf baxışdan ibarətdir. Yol xəritəsində 4 strateji hədəf müəyyənləşdirilib ki, onlardan da üçüncüsü “İnsan kapitalının inkişaf etdirilməsi” adlanır. İnsan kapitalı əmək məhsuldarlığının artırılmasında, dayanıqlı iqtisadi artımda, istehsal və xidmət sektorlarının rəqabət qabiliyyətinin yüksəldilməsində və ölkənin qlobal bazarlara inteqrasiyasında həlledici rol oynayır. Bu məsələ ilə bağlı pedaqogika üzrə fəlsəfə doktoru, dosent İlham Əhmədov müəllim və tələbələrə ətraflı məlumat verib. Qeyd edib ki, insan kapitalının inkişafı təhsilin bütün pillələrində keyfiyyətin yüksəldilməsindən, təlimlər vasitəsilə işçilərin bilik və bacarıqlarının inkişaf etdirilməsində fasiləsizliyin təmin edilməsindən, ixtisaslı kadr hazırlığının əmək bazarının tələblərinə uyğunlaşdırılmasından, şirkətlərin araşdırma və təkmilləşdirmə sahəsinə investisiya qoyuluşunun stimullaşdırılmasından, mövcud insan kapitalından səmərəli istifadə edilməsindən asılıdır.



## Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsində “Qloballaşma və insan inkişafı” mövzusunda elmi seminar

Oktyabrın 17-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsində Rusiya Təhsil Akademiyasının UNİTVİN-UNESKO şəbəkə kafedrası ilə birgə “Regional şəbəkə tərəfdaşlığı:Qlobal dünyada yaşamağı öyrənək!” pilot layihəsinin tərəfdaşı olaraq ADPU-da reallaşdırılan tədbirlər planı çərçivəsində “Qloballaşma və insan inkişafı” (BMT-nin İnkişaf Proqramı əsasında) mövzusunda elmi seminar keçirilib. Seminarda fakültənin ixtisas kafedralarının müəllimləri və tələbələr iştirak ediblər. Seminarı fakültənin dekanı, pedaqogika üzrə elmlər doktoru Şəhla Əliyeva açaraq tədbirin əhəmiyyətindən və məqsədindən danışıb. Ümumi psixologiya kafedrasının müdiri, professor Ramiz Əliyev geniş və məzmunlu məruzə ilə çıxış edib. Məktəbəqədər təhsilin pedaqogikası və metodikası kafedrasının müdiri, professor Müseyib İlyasov, kafedranın baş müəllimi, pedaqogika üzrə fəlsəfə doktoru Sədaqət Əliyeva, Ümumi psixologiya kafedrasının baş müəllimi, psixologiya üzrə fəlsəfə doktoru Lamiyə Qurbanova və başqaları maraqlı çıxışlar ediblər.



**Sədaqət Əliyeva,**
**Baş müəllim, pedaqogika üzrə fəlsəfə doktoru**

## Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədər hazırlıq fakültəsində Tələbələrin I İfaçılıq və Yaradıcılıq Müsabiqəsi

Oktyabrın 28-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədər hazırlıq fakültəsində Azərbaycanın görkəmli bəstəkarı Tofiq Quliyevin 100 illik yubileyinə həsr olunmuş Tələbələrin I İfaçılıq və Yaradıcılıq Müsabiqəsinin I turu keçirilib. Qeyd edək ki, müsabiqə 3 nominasiya üzrə: instrumental ifaçılığı (fortepiano, tar), vokal ifaçılığı və rəsm üzrə aparılır.



ADPU-nun Tərbiyə işləri üzrə prorektoru, Münsiflər Heyətinin sədri, professor Fikrət Rzayev, Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədər hazırlıq fakültəsinin dekanı, dosent Laçın Həsənova, Musiqi və onun tədrisi metodikası kafedrasının müdiri, professor Zemfira Abdullayeva, həmin kafedranın dosenti, Azərbaycan Bəstəkarlar İttifaqının üzvü, Əməkdar incəsənət xadimi Nailə Mirməmmədli, Təsviri incəsənət və onun tədrisi metodikası kafedrasının müdiri, dosent Çingiz Rüstəmov, Bakı Musiqi Akademiyasının baş müəllimi Gülbəniz Abdullayeva, Azərbaycan Mədəniyyət və İncəsənət Universitetinin İnstrumental ifaçılıq kafedrasının dosenti Camalə Nəsirovanın təmsil etdikləri Münsiflər Heyəti instrumental ifaçılıq və vokal ifaçılığı nominasiyaları üzrə çıxış edən tələbələri dinləyiblər.

I turda instrumental ifaçılığı nominasiyası üzrə 8 ifaçı, vokal ifaçılığı nominasiyası üzrə 6 ifaçı iştirak edib. I turun nəticələrinə görə instrumental üzrə 5 ifaçı (4-ü fortepiano, 1-i tar) və vokal üzrə 4 ifaçı müsabiqənin II turuna keçiblər. Məlumat üçün bildirək ki, müsabiqənin II turu noyabrın 4-də ADPU-nun III tədris binasında, saat 11.00-da keçiriləcək.

Müsabiqənin qalibləri aşağıdakı kimi mükafatlandırılacaq: I yer - 200 manat, II yer - 150 manat, III yer - 100 manat.

## ADPU-nun Şəki Filialında milli müstəqilliyin bərpasının 26-cı ildönümünə həsr olunmuş elmi-nəzəri konfrans

Oktyabr 18-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şəki Filialında milli müstəqilliyin bərpasının 26-cı ildönümünə həsr olunmuş “18 oktyabr-çağdaş tariximizdə yeni mərhələnin başlanğıcıdır” mövzusunda elmi-nəzəri konfrans keçirilib. Azərbaycanın Dövlət Himninin səsləndirilməsi ilə öz işinə başlayan konfransı filialın elmi işlər üzrə direktor müavini, dosent Nuralı Çələbiyev açıb. Sonra filialın Humanitar fənlər kafedrasını müdiri, tarix üzrə fəlsəfə doktoru Vüsal Baxışovun “Müstəqilliyimizin bərpası tarixi zərurət və ədalətin təntənəsi kimi” mövzusunda məruzəsi dinlənilib. Konfransda Ümumelmi fənlər kafedrasının müdiri, pedaqogika üzrə fəlsəfə doktoru Sədrəddin Bədiyev “Milli müstəqilliyimizin bərpası və möhkəmləndirilməsində Heydər Əliyevin tarixi xidmətləri”, “Tarix və çoğrafiya müəllimliyi” ixtisasının III tədris ili tələbəsi Cavid Qasımov “Azərbaycanın milli müstəqilliyi və çağdaş tariximiz” mövzularında çıxışlar ediblər.





Konfransın bədii hissəsində filialın tələbələrinin təqdimatında Xəlil Rza Ulutürkün “Azadlıq”, Nəriman Həsənzadənin “Azərbaycan” şeirləri dinlənilib, 1991-ci il 18 oktyabr tarixdə Milli Məclisin iclasında “Azərbaycan Respublikasının dövlət müstəqilliyi haqqında Konstitusiya Aktı” nın qəbul olunması mərasiminə aid videoçarx nümayiş etdirilib.

Konfransda filialın tədris işləri üzrə direktor müavini, dosent Gülarə Abdullayeva yekun sözü ilə çıxış edərək bildirib ki, Azərbaycanın dövlət müstəqilliyinin bərpa edilməsi xalqımızın böyük tarixi naliyyəti və ən dəyərli mənəvi sərvətidir. Müstəqilliyi göz-bəbəyi kimi qorumaq, dövlətçilik ruhunu yaşatmaq, sonrakı nəsillərə ötürmək hər bir vətəndaşın müqəddəs amalı və borcu olmalıdır.

## ADPU-nun nəzdində ADPK-də “Şəhadət” sənədli filmi nümayiş olunub

Oktyabrın 11-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecində (ADPK) Dini Qurumlarla İş üzrə Dövlət Komitəsinin sifarişi ilə hazırlanan “Şəhadət” sənədli filmi nümayiş olunub. Tədbirdə Dini Qurumlarla İş üzrə Dövlət Komitəsinin Təhlil və proqnozlaşdırma şöbəsinin müdiri Elnarə Kərimova, Dinşünaslıq ekspertizası şöbəsinin əməkdaşı Zeynəb Tayıbova, ADPK-nin Tərbiyə işləri üzrə direktor müavini Nigar Şirəliyeva və kollecin tələbələri iştirak ediblər.



Tədbiri giriş sözü ilə açan ADPK-nin Tərbiyə işləri üzrə direktor müavini Nigar Şirəliyeva belə filmlərin gənclərin maarifləndirilməsində əhəmiyyətindən danışıb. Dini Qurumlarla İş üzrə Dövlət Komitəsinin Təhlil və proqnozlaşdırma şöbəsinin müdiri Elnarə Kərimova öz çıxışında ”Şəhadət” filminin əhəmiyyətindən bəhs edərək, filmin hazırlanmasında əsas məqsədin gənclərin vətənpərvərlik ruhunda tərbiyəsinə töhfə vermək, dini fanatizm, radikalizm və ekstremizm meyillərinə qarşı onları məlumatlandırmaq olduğunu diqqətə çatdırıb.

Tədbirdə milli-mənəvi dəyərlərimizin - ənənəvi İslam dəyərlərinin təbliğinin dini radikalizmə və xurafata qarşı mübarizədə önəmli vasitə olduğu vurğulanıb.

Sonda tədbir iştirakçılarını maraqlandıran suallar cavablandırılıb.

# ADPU-nun Şamaxı Filialında 5 Oktyabr - Beynəlxalq Müəllimlər Gününə həsr edilmiş tədbir

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şamaxı Filialında 5 Oktyabr-Beynəlxalq Müəllimlər Gününə həsr edilmiş tədbir keçirildi. Tədbirdə filialın professor-müəllim heyəti və tələbələri iştirak edirdi. Təbrik sözü ilə çıxış edən filialın direktoru, dosent Tünzalə Yusifova müəllim və tələbələri Beynəlxalq Müəllimlər Günü münasibəti ilə təbrik etdi, hər kəsə xoş arzularını çatdırdı. O, qeyd etdi ki, ümummilli liderimiz Heydər Əliyev tərəfindən 1993-cü ildə təssis edilən bu əlamətdar gün müəllimlərin cəmiyyətdəki mövqeyini, ölkənin yalnız təhsil sahəsində deyil, bütün sahələrindəki inkişafında olan roluna diqqət çəkməyi nəzərdə tuturdu. “Hər birimizdə müəllimin hərarətli qəlbinin bir zərrəciyi var” deyən ulu öndər Heydər Əliyevin layiqli davamçısı, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin müəllim




ordusunun himayədarı kimi yorulmaz fəaliyyəti biz təhsil işçilərini Azərbaycan xalqı və dövlətinə xidmət yolunda daha da ruhlandırır.

I tədris ili tələbəsi Hilal Mürsəlov tələbələr adından başda filialın direktoru Tünzalə Yusifova olmaqla pedaqoji kollektivi təbrik etdi, onlara cansağlığı, şərəfli peşələrində uğurlar arzuladı. Eyni zamanda bir neçə il sonra müəllim adını qazanacaqları üçün qürur duyduqlarını bildirdi.

Sonra tələbələr hazırladıqları bədii kompozisiyalarla müəllimlərini sevindirdilər. I tədris ili tələbələri Güldəstə Nəsiblinin “Müəllim”, Nərmin Qasımovanın “Müəllim ömrü” adlı şeirləri söyləmələri, Fəqan Yaqublu və Şəmsiyyə Babaşzadənin “Uzundərə” milli rəqsini ifa etmələri, II tədris ili tələbəsi Aytən Əhmədovanın “Əziz müəllimim” mahnısını səsləndirməsi tədbir iştirakçılarında yüksək əhvali-ruhiyyə yaratdı.

Qeyd edək ki, tədris ilinin əvvəlindən filialda Beynəlxalq Müəllimlər Günü ilə bağlı rəsm müsabiqəsi elan edilmiş, sentyabrın 30-da isə bu münasibətlə intellektual bilik yarışı keçirilmişdir. Bugünkü tədbirdə müsabiqədə iştirak edən tələbələrin rəsm əsərləri nümayiş olundu. Münsiflər heyətinin rəsmlərə baxışından sonra I və II yerlərə layiq görülən tələbələr diplomla, digər iştirakçılar isə həvəsləndirici yerlərlə mükafatlandırıldılar. Eyni zamanda intellektual bilik yarışının qalibi olan “Senator” komandası və yarışda xüsusi fəallıqla iştirak edən Elvin Əhmədov diploma layiq görüldü.

# ADPU-nun Ağcabədi Filialında “İslam həmrəyliyi məhzəb ayrı-seçkiliyinə qarşıdır” layihəsi çərçivəsində maarifləndirici tədbir



Oktyabrın 26-da Dini Qurumlarla İş üzrə Dövlət Komitəsinin (DQİDK) dəstəyi ilə Ağcabədi rayonu “Seyid Mürsəl Ağa” məscidi dini icmasının Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Ağcabədi Filialında “İslam həmrəyliyi məhzəb ayrı-seçkiliyinə qarşıdır” layihəsi çərçivəsində maarifləndirici tədbir keçirilib.

Tədbirdə DQİDK-nın Ağcabədi bölgəsi üzrə şöbəsinin müdiri Əlizadə Nəcəfov, Ağcabədi Rayon İcra Hakimiyyəti (RİH) başçısı Aparatının İctimai-siyasi və humanitar məsələlər şöbəsinin müdir müavini, dini qurumlarla işin təşkilatçısı Təyyar Hacıyev, “Seyid Mürsəl Ağa” məscidi dini icmasının sədri Zeynəb Quliyeva və ictimaiyyət nümayəndələri iştirak ediblər.

Tədbiri giriş sözü ilə açan ADPU-nun Ağcabədi Filialının direktoru, dosent Mətanət Fərzəliyeva Azərbaycandakı etnik və dini sabitliyin qorunmasında gənclərin mövqeyindən danışıb.

İcma sədri Zeynəb Quliyeva tədbir iştirakçılarına bu tədbirin mahiyyəti barədə məlumat verərək bildirib ki, 2017-ci ilin “İslam Həmrəyliyi İli” elan edilməsi təkcə İslam aləmində deyil, bütün dünyada mühüm əhəmiyyətə malikdir: “Bu mənada bəşəriyyətin xilası kimi həmrəyliyin gündəmə gətirilməsi Azərbaycanın dünyada xilaskarlıq missiyasının yerinə yetirilməsinə öz töhfəsini verməsi mənasını ifadə edir” - deyə o qeyd edib.

Ağcabədi RİH başçısı Aparatının İctimai-siyasi və humanitar məsələlər şöbəsinin müdir müavini, dini qurumlarla işin təşkilatçısı T.Hacıyev deyib ki, Azərbaycanda 2017-ci ilin “İslam Həmrəyliyi İli” elan edilməsi İslam dünyasına birlik, vəhdət və həmrəylik çağırışıdır. Öz çıxışında ADPU-nun Ağcabədi Filialının fəaliyyətini yüksək qiymətləndirən T.Hacıyev belə maarifləndirici tədbirlərin tələbə-gənclərin sağlam ruhda tərbiyə olunmalarına səmərəli təsir etdiyini vurğulayıb.

DQİDK-nın Ağcabədi bölgəsi üzrə şöbəsinin müdiri Əlizadə Nəcəfov bildirib ki, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin İslam həmrəyliyinə çağırışı intibah ideallarına, İslam coğrafiyasında olan xalqların və ölkələrin iqtisadi, elmi, mədəni əməkdaşlığına, eyni zamanda İslam dininin irəli sürdüyü bərabərlik, ədalət, mənəviyyat, insanpərvərlik ideyalarına real çağırışları diqqət mərkəzinə çəkməyə xidmət edir.

Mövzu ətrafında filialın müəllimləri - dosent Tahir Kərimli, dosent Mahir Səlimov və tədris işləri üzrə direktor müavini Seymur Quliyev çıxış edərək vurğulayıblar ki, belə tədbirlərin keçirilməsi və Dövlət Komitəsi tərəfindən çoxsaylı kitabların çap edilməsi radikalizmə qarşı mübarizədə mühüm rol oynayır.

Sonda iştirakçıları maraqlandıran suallar cavablandırılıb.

Qeyd edək ki, maarifləndirmə tədbiri Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin ölkədə dini maarifləndirmə və milli-mənəvi dəyərlərin təbliği işini daha da gücləndirmək məqsədilə dini icmalara maliyyə yardımı göstərmək üçün 2014-cü il noyabrın 27-də imzaladığı Sərəncama əsasən keçirilib.

# ADPU-nun Quba Filialında 5 Oktyabr-Beynəlxalq Müəllimlər Gününə həsr edilmiş tədbir

Oktyabrın 5-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Quba Filialında 5 Oktyabr-Beynəlxalq Müəllimlər Gününə həsr edilmiş tədbir keçirilib. Tədbirdə əvvəlcə Azərbaycanın Dövlət Himni səsləndirilib. Tədbiri giriş sözü ilə açan filialın direktoru, professor Əli Allahverdiyev müəllim və tələbələri əlamətdar gün münasibətilə təbrik edib, bu şərəfli peşənin əhəmiyyətindən danışıb.

Sonra tədbirdə filialın Təbiət fənləri və onun tədrisi metodikası kafedrasının müdiri, dosent Güləddin Həmzəyev, Ədəbiyyat və dillər kafedrasının müdiri, dosent Gülşən Ağabəy, Tərbiyə işləri üzrə direktor müavini Aysel Şeydayeva çıxış edərək tədbir iştirakçılarına xoş arzularını çatdırıblar.



Tədbirdə bu il filiala 500-dən yüksək balla qəbul olunan tələbələrə və tələbə kollektivinin ümumi rəyi əsasında bəzi müəllimlərə filialın Tələbə Elmi Cəmiyyətinin (TEC) diplomları təqdim olunub.

Tədbir tələbələrin hazırladıqları şeir və musiqi nömrələri ilə başa çatıb.

# ADPU-nun Cəlilabad Filialında 18 Oktyabr-Dövlət Müstəqilliyi Günü ilə əlaqədar tədbir

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Cəlilabad Filialında 18 Oktyabr-Dövlət Müstəqilliyi Günü ilə əlaqədar tədbir keçirilib. Tədbir Azərbaycan Respublikasının Dövlət Himninin səsləndirilməsi ilə başlayıb. Giriş sözü ilə çıxış edən filialın direktoru, dosent Xudayar Sultanlı müəllim və tələbələri təbrik edib. XX əsrin 90-cı illərində Azərbaycanda gedən milli-azadlıq mübarizəsi haqqında danışıb. 1991-ci ilin oktyabrında qəbul edilmiş Konstitusiya Aktının əhəmiyyətini göstərib. Müstəqilliyimizin qorunmasında ümummilli liderimiz Heydər Əliyevin gördüyü işlərdən söz açıb. Müasir dövrdə respublikamızda gedən yeni cəmiyyət quruculuğu, Heydər Əliyev ideyalarının davam etdirilməsi barədə fikirlərini bölüşüb.




Tədbirdə çıxış edən tarix üzrə fəlsəfə doktoru Məmmədhəsən Əliyev Azərbaycanın dövlətçilik ənənələri, Şöhrət Namazova isə müstəqilliyimizin qorunub saxlanılmasında, gənclərdə milli ideologiyanın formalaşmasında ulu öndər Heydər Əliyevin tarixi xidmətləri barədə söhbət açıblar.

Tələbələr çıxışlarında 18 oktyabr 1991-ci il tarixinin xalqımızın həyatındakı böyük əhəmiyyətindən danışıblar. Bədii hissədə tələbələr Azərbaycan şairlərinin müstəqillik haqqında şeirlərini söyləyiblər.

## Allah rəhmət eləsin!

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Ümumi pedaqogika kafedrasının dosenti Heydər Cəfərova qardaşı

**Yaqub Cəfərovun**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Fəlsəfə və sosial fənlər kafedrasının baş müəllimi

**İradə Əliyevanın**

vəfatından kədərləndiyini bildirir, mərhumun ailəsinə və yaxınlarına dərin hüznlə başsağlığı verir.

Redaktor: Nigar ABBASOVA
Məsul katib: Mahirə MUSTAFAYEVA

ÜNVANIMIZ: Bakı, Ü. Hacıbəyli küçəsi, 68 ADPU, Tel.: 498-18-41

Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır

ADPU-nun web-portalı: adpu.edu.az
Fotolar Nurlan Səmədovundur
Şəhadətnamə № 191

Sifariş: 3180
Sayı: 1500
Çapa imzalanıb: 31.10.2017-ci il

ADPU-nun İctimaiyyətlə əlaqələr şöbəsinin kompüter mərkəzində yığılıb, “Azərbaycan” nəşriyyatında səhifələnib və “Azərbaycan” nəşriyyatının mətbəəsində ofset üsulu ilə çap edilmişdir.